filologiya elmləri namizədi

Redaktoru:

İsmayıl İSMAYILOV,
filologiya elmləri namizədi

Kompüter icraçısı:

Sonaxanım ƏHMƏDOVA

Korrektoru:

Suad ƏHMƏDOV

**İsmayıl bəy Nakam. Məcnun və Leyli. Bakı: Nurlan, 2007, 190 s.**

## XIX ƏSR AZƏRBAYCAN ŞAİRİ İSMAYIL BƏY NAKAM

Azərbaycan ədəbiyyatı tarixində realizmin formalaşıb möhkəmlənməsində, sənətin bir çox sahələrində aparıcı bir metoda çevrilməsində XIX əsr xüsusi bir mərhələdir. Təsadüfi deyil ki, əsrin ilk illərində rüşeym kimi meydana gələn realist meyllər əsrin ikinci yarısından etibarən poeziyada və nəsrdə, dramaturgiya və publisistikada əsas və aparıcı bir metoda çevrildi, romantik poeziyanı sıxışdırıb sənət meydanından çıxarmağa başladı. Nəsr və dramaturgiyada M.F.Axundov, şerdə Q.Zakir və S.Ə.Şirvani, publisistika sahəsində H.Zərdabi kimi realist-maarifçilərin səyi və təşəbbüsü nəticəsində Azərbaycan ədəbiyyatı xalq həyatına daha

da yaxınlaşdı, onun əsl tərcümanı oldu. Lakin bu dövrdə klassik poeziya ənənələrini inadkarlıqla davam etdirən, lakin müasir həyat hadisələrini də təsvir və tərənnümə çalışan şairlər də yox deyildi. Belə sənətkarlardan biri də İsmayıl bəy Nakam olmuşdur. Nakamın yaradıcılıq yolu olduqca mürəkkəb və ziddiyyətlidir.

İ.Nakam 1839-cu ildə Şəki şəhərində anadan olmuşdur. Onun ulu babaları XVIII əsrdə qədim Şamaxı şəhərindən köçüb Şəkiyə gəlmiş, oranı vətən etmişdir. İsmayıl bəyin atası Məhəmməd bəy Sədrəddinbəyov öz dövrünün hörmətli şəxslərindən idi. İsmayıl bəy ilk təhsilini mollaxanada almış, bundan əlavə, üç ilə yaxın rus dilini xüsusi müəllimlərdən öyrənmişdi. Nakam ərəb-fars dillərini də mükəmməl bilirdi. O, gəncliyində Yaxın Şərqin bir sıra mədəni mərkəzlərinə və Hindistana səyahət edərək zəngin bilik qazanmışdır. Akademik F.Qasımzadə yazır: «Ədəbi məclislər dövründə Şəkidə yetişən lirik şairlər içərisində əsas yeri İsmayıl bəy Nakam tuturdu. Nakam fars və ərəbcə mükəmməl təhsil almış, Bahar Şirvani kimi o da gənc yaşlarında Hindistanı və Yaxın Şərq ölkələrini gəzmiş, klassik ədəbiyyatla, xüsusilə Füzuli və Nizaminin əsərləri ilə tanış olmuşdur».[1]

Nakam zəngin biliyə, gözəl şairlik təbinə malik, mülayim, «xoşxülq və xoşrəftar» bir şəxs idi \F.Köçərli /.

Qeyd etmək lazımdır ki, dövrünün ziyalı və qədrbilən şəxsləri şairə dərin hörmət bəsləmiş və ona maddi və mənəvi yardım göstərmişdir. Şair «Məcnun və Leyli» poemasının sonunda minnətdarlıqla Qutqaşınlı Mehdi bəy Qədirbəyzadənin adını yad edir. Hacı Zeynalabdin Tağıyev Nakamın əsərlərini nəşr etdirmək üçün təşəbbüs göstərmiş, lakin onun bu xoş arzusu reallaşmamışdır.

Görkəmli ədəbiyyatşünas F.Köçərli Nakama yüksək qiymət verərək yazırdı: «Nuxa şairlərinin ən məşhuru və müqtədiri İsmayıl bəy Nakamdır… Tamami-Şəki mahalında əvvəlinci şair hesab olunur. Əsərlərindən üç böyük divanı vardır ki, onlardan biri «Gənci-ədəb» («Gəncineyi-ədəb» - Y.P.) namilə məşhur və otuz bir məqalədən ibarət bir kitabdır. Nakamın əlimizə düşən əsərlərindən görünür ki, onun çox açıq və rəvan təbi varmış».[2]

---

[1] F.Qasımzadə. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. Bakı: Maarif, 1974.

[2] Bax: F.Köçərli. Azərbaycan ədəbiyyatı tarixi. II c. Bakı: Elm, 1981, s.284.

Köçərli Nakamın üç qəzəlini, bir qəsidəsini və iki tərcibəndini bütövlüklə nümunə olaraq öz kitabına daxil etmişdir, şairin sənətkarlıq məharətindən danışmış, ana dilinə üstünlük verməsini təqdirəlayiq bir hadisə adlandırmışdır.

Həqiqətən, başqa dilləri bilsə də, Nakamın bütün əsərləri doğma Azərbaycan dilindədir. Nakam öz dövrünün nüfuzlu bir şairi olduğu üçün onun hər yerdə səmimi dostları olmuşdur. Şamaxıda böyük şair Seyid Əzim Şirvani, Qutqaşında Mehdi bəy Qədirbəyzadə, Bakıda H.Z.Tağıyev və başqaları şairə hörmət və ehtiramla yanaşmışdır.

Nakam «Divani-bədii», «Xəyaləti-pərişan» adlı divanların, «Gəncineyi-ədəb», «Fərhad və Şirin», «Məcnun və Leyli» klassik üslubda yazdığı irihəcmli epik poemaların, nəsrlə yazılmış didaktik məzmunlu «Dörd əfəndi» və «Lətifnamə» əsərlərinin müəllifidir.

İ.Nakam dahi şairimiz Nizami «Xəmsə»sinə nəzirə yazmaq fikrində olmuş, lakin şairin üç poemasına cavab yaza bilmişdir. Belə ki, «Sirlər xəzinəsi»nə cavab olaraq «Gəncineyi ədəb» / «Mərifət xəzinəsi», «Xösrov və Şirin»ə nəzirə kimi «Fərhad və Şirin»i və «Leyli və Məcnun» poemasına cavab «Məcnun və Leyli»ni yazmışdır.

Nakamın yaşayıb-yaratdığı illərdə Azərbaycan feodal-patriarxal münasibətlərin hökm sürdüyü bir ölkə idi, mərkəzi Rusiyanın ucqarlarından biri sayılırdı. Burada XIX əsrin abhavası Qərbi Avropada və Rusiyanın mərkəzində olduğu səviyyədə hiss olunmurdu. Ədəbiyyatda müəyyən durğunluq hökm sürürdü. Xüsusilə o zamankı ədəbi məclislərdə pərakəndəlik duyulurdu. Nizami və Füzuli mövzularına nəzirə yazmaq bir ənənəyə çevrilmişdi. Şəkidə isə heç bir məclis fəaliyyət göstərmirdi. Odur ki, Şəkidə yaşayan şairlərin yaradıcılığına müəyyən istiqamət verən olmamış, görkəmli Şəki şairləri Şirvan və ya Qarabağ şairləri ilə qismən əlaqə saxlaya bilmişlər. Xüsusilə Nakam və Molla Qasım Zakir Şirvan şairləri, onların «Beytüs-Səfa» ədəbi məclisi ilə yazışmış və arabir görüşmüşlər. Hətta Molla Qasım Zakirin Şirvan şairləri ilə görüşü, deyişməsi, məğlub olması və nəhayət, orada faciəli ölümü haqda mənbələrdə məlumat da vardır.[3]

Nakam 1905-ci ildə öz əsərlərini çox təmiz və səliqəli bir şəkildə köçürərək divan tərtib etmişdir. Görünür, şair öz ədəbi irsinin taleyi

---

[3] Bax: F.Köçərli. Azərbaycan ədəbiyyatı tarixi. I c. Bakı: Elm, 1978, s. 457.

ilə maraqlandığı üçün «Gəncineyi-ədəb» və qəzəlləri ilə birlikdə «Məcnun və Leyli», «Fərhad və Şirin» poemalarını iki mükəmməl divanda cəmləşdirmişdir. Hər iki divan AMEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunda mühafizə edilir.

Nakam 1906-cı ildə Şəkidə vəfat etmiş və Şəkinin Xoçik qəbristanlığında dəfn edilmişdir.

Şəkidə böyük bir kitabxana Nakamın adını daşıyır.

G g

Nakam bütün ədəbi irsini klassik üslubda – qəzəl, qəsidə, qitə, poema, mənzum hekayə və başqa şer janrlarında yazıb-yaratmışdır. Sağlığında şairin əsərləri çap olunmadığı üçün əlyazma halında şəxsi əllərdə qalmış, sonralar bu əlyazmaları müxtəlif yollarla AMEA Əlyazmalar İnstitutuna verilmişdir. Lakin Nakamın əsərlərindən yenə də şəxsi əllərdə qalanları vardır.

Nakam haqqında ilk məlumata görkəmli alim F.Köçərlinin «Azərbaycan ədəbiyyatı tarixi materialları» kitabında rast gəlirik. Köçərlinin etirafına görə, Nakamın əlyazmalarını ona Salman Mümtaz vermişdir. Lakin, nədənsə, S.Mümtaz Nakam haqda əsərələrində heç bir məlumat verməmişdir. Köçərli isə Nakamın yaradıcılığından müxtəsər bəhs etmiş, sənətkarlıq məharətini, sözdən istifadə qabiliyyətini tərifləmişdir.

1928-ci ildə Əliabbas Müznib Nakam yaradıcılığına müraciət etmiş, onun həyat və yaradıcılığından qısa söhbət açmış, əsərlərindən nümunələr «Seçmə parçalar» adı ilə bir kitabda çap etdirilmişdir. «Seçmə parçalar»a Nakamın qəzəllərindən nümunələr, «Gəncineyi-ədəb» poemasından bir parça, «Fərhad və Şirin» poeması isə kiçik ixtisarla daxil edilmişdir.[4] Prof. Cəfər Xəndan XIX əsr Azərbaycan poeziyasına Nizami təsirindən bəhs edərkən Nakamın «Fərhad və Şirin» poemasından bəhs etmiş, poemanın dil və üslubundan danışmışdır.

AMEA Nizami adına Ədəbiyyat İnstitutunun elmi işçisi N.Qarayev XIX əsr Azərbaycan ədəbi məclislərini tədqiq edərkən öz elmi işində qismən Nakam yaradıcılığına toxunmuş, Nakamın şer məclisləri ilə əlaqələrinə öz əsərində yer vermişdir.[5] Bu sətirlərin müəllifi «XIX əsr Azərbaycan ədəbiyyatında poema janrı» adlı

---

[4] S.Əfəndiyev. Nakam poemaları. APİ-nin Elmi əsərləri, 1962, XXII c.
[5] Bax: N.Qarayev. Azərbaycan ədəbi məclisləri (Namizədlik dissertasiyası).

namizədlik əsərində Nakam poemalarını öz tədqiqat işinə daxil edərək, onun «Gəncineyi-ədəb», «Fərhad və Şirin», «Məcnun və Leyli» poemalarının mövzusu, kompozisiyası, surətlər aləmi və bu poemaların bədii xüsusiyyətlərindən imkanı daxilində söhbət açmışdır.[6]

İlk növbədə onu demək lazımdır ki, Nakam öz müasirlərinin çoxundan sadə və aydın dildə yazmış, oxucusu ilə anlaşıqlı bir tərzdə danışmağa çalışmışdır. Şairin «Məcnun və Leyli» poemasında bunu hiss etmək olar. Əsərin maraqlı epizodlarından birində şair bahar çağında Leylinin rəfiqələri ilə gəzməyə çıxmasını, orada Məcnunla rastlaşması və Leylinin huşunu itirməsini, rəfiqələrinin onu məzəmmət edib evlərinə gətirmələrini təsvir edir. Bu epizodla şair olduqca yığcam, aydın və mənalı təsvir üsulundan və vasitələrində istifadə edir.

Dedilər: Ey güli-bağì-nəzakət,
Sənə şayan deyildir bu fəlakət
Ki, sən bir nazənini-bibədənsən,
Bədəlsiz bir mələksima gözəlsən,
Sənə bu eşq, bu sevda nə layiq,
Sənin rüxsarinə aləmdir aşiq.
Bu halə valideynin olsa agəh,
Səni töhmətzədə edərlər, ey məh!
Bu məzmun söyləyib neçə fəsanə,
Gətirdilər o mahi xanimanə… [7]

Burada müəllif perefrazalardan məharətlə istifadə etmişdir. Rəfiqələri onu Leyli yox, «Nəzakət bağının gülü», və yaxud «Ey Məh» deyə çağırırlar.

Yaxud Nəcd qəbiləsi gənclərinin Məcnunu öldürmək istədikləindən xəbər tutan atanın öz oğlunu evə dəvət etmək istədikdə ona müraciəti, onunla söhbəti də çox aydın və mənalıdır. Həmin epizoddan kiçik bir parçanı oxucuya təqdim etməyi lazım bildik:

Sənə nə oldu ki, böylə zar oldun?
Bəlayi-eşqdə bimar oldun?
Nədir bu ah, bu nalə, bu şuriş,
Nədir bu eşq, bu atəş, bu suziş?

---

[6] Y.Piriyev. XIX əsr Azərbaycan ədəbiyyatında poema janrı. Bakı: 1971.

[7] İ.Nakam. Məcnun və Leyli. AMEA Əlyazmalar İnstitutu, M-40.

Dəxi yetməzmi biaram olmaq,
Bu rütbə bihudə bədnam olmaq?
Kimin nifrəti kim, qılmış sirayət,
Səni etmiş giriftari-fəlakət?
Kimin ahi sənə təsir edibdir,
Səni məcnuni-bizəncir edibdir?
… Yetər möhnət, yetər həsrət, yetər dərd,
Yetər olma dəxi bica cəhangərd!
… Nədir bu məst olmaq camü cəmsiz,
Nədir bu bütpərəst olmaq sənəmsiz? [8]

«Məcnun və Leyli» poemasının bir yerində Nakam özünün ağır vəziyyətindən şikayətlənir, o bildirir ki, fələk ağıllı, istedadlı adamları mərifət sahiblərini «möhnət zəncri» ilə buxovlayır, nadanı isə xoşbəxb edir, ucaldır. Beləlrinə fələk öz səxavətini əsirgəmir. Lakin qabiliyyət sahiblərinə min dərd, bəla verərək vaxtsız qocaldır, məhv edir. Sonra şair özünün ağır güzəranından söhbət açır. Həyatı boyu işgəncə və məhrumiyyətə düçar olan şairin müasir həyatı, onun bəd rəftarına üsyanı, nifrəti və qəzəbi açıq-aydın duyulur. Bu epizodla Nakam çərxi ədalətsiz hərəkətinə görə ittihama çəkir, tənqid edir:

Nə yerdə var isə əhli-məhəbbət
Edirsən bəsteyi-zənciri-möhnət.
Edirsən mehr kim naqabil olsa,
Qılırsan lütf kim bihasild olsa…
Verib hər dəmdə bir gunə şkəncə,
Yetirdin ömrümü pəncaho pəncə.
Kədərdən, qüssədən fərq etmədim mən,
Nə vaxt açdı, nə dəm soldu bu gülşən.
Açıb göz bağrımı qan görmüşəm mən.
Məni boylə pərişan görmüşəm mən …

Dastanın bu hissəsində sanki Nakam qəhrəmanlarının faciəli sərgüzəşti ilə birlikdə öz şəxsi həyat dastanını da yaradır, özü ilə qəhrəmanları arasında tale yaxınlığı, eyniyyət görür:

Olub peyvəsətə dövründən pərişan,
Cahanda olmadım bir ləhzə xəndan …

Şairin belə açıq tənqidi fikirləri, etiraz və narazılığı onu müasirlərindən fərqləndirir. Şair XIX əsrin ortalarından başlayaraq ölkədə güclənən zülmü, istismarı, ictimai ədalətsizliyi görüb duyduğu üçün fəğana gəlir, qurtuluşu kənarda axtarırdı. Odur ki, şair fələyə

[8] Yenə orada, s.48-49.

müraciətlə:

Yetər bidad isə bu pay bəsdir,
Demə bu bikəsü bidadirəsdir!

Məlumdur ki, Yaxın Şərq poeziyasında «Fələk», «çərx», «gərdun» və s. ifadələrlə şairlər zəmanəni, ictimai quruluşu və bəzən «yaradanı» nəzərdə tuturdular. Nizami və Füzuli yaradıcılığında da belədir. İ.Nakam da öz böyük ustadlarının yolu ilə gedərək zəmanəsində həddini aşan ədalətsizlikləri bu rəmz altında tənqid etmişdir.

Əlbəttə, bütün bu cəhətləri Nakamın poemasını klassik «Leyli və Məcnun»lardan fərqləndirir, onu XIX əsr Azərbaycan xalqının həyatının bəzi məsələləri ilə əlaqələndirir. Poemanın sadə dili, hadisələrin tarixdən daha çox müasir həyat və mühitlə səsləşməsi fikrimizi təsdiq edir.

Janr etibarilə «Məcnun və Leyli» epik-lirik poemadır. Müəllif, Nizami və Füzuli poemalarından bəhrələnsə də, özünəməxsus bir əsər yaratmağa çalışmışdır. Epik təsvirlərdə məlum süjet əsasında hadisələri nəql etməyə, romantik bir dastan yaratmağa cəhd edirsə, lirik ricətlərdə, saqinamə və «Xatimə» adlanan epiloqda daha çox müasir hadisələrə meyl edir.

«Xatimə» adlanan hissədə Nakam öz yaşadığı dövrün tənqidini də unutmur. Şerə, sənətə və sənətkara biganə münasibətə qarşı öz etirazını bildirir. Bu sətirləri oxuyanda yenə yadımıza dahi şairimiz Füzuli, onun ürəkağrısı ilə yazdığı qəmli misralar düşür:

Bir dövrdəyəm ki, nəzm olub xar,
Əşar bulub kəsadi-əsar.
Ol rütbədə qədri-nəzmdir dun –
Kim, küfr oxunur kəlami-mövzun …
Min riştəyə türfə ləl çəksəm,
Min rövzəyə nazənin gül əksəm.
Qılmaz ona hiç kim nəzarə,
Derlər gülə xar, lələ xarə. [9]

Nakam öz zəmanəsinə tənqidi münasibəti belə ifadə edir:

Ki, vəqtimdə mənim əhli-zəmanə
Edərdi kinə mərdi-nüktədanə.
Kimə etsəydim izhari-məhəbbət,
Olurdu afərini təneyü töhmət.
Kimə kim, olmuş olsaydım qəzəlxan,

---

[9] M.Füzuli. Seçilmiş əsərləri. Bakı: Azərnəşr, 1988, s.6-7.

Olurdu eyləyib nifrəti-gərizan...[10]

Nakamın «Məcnun və Leyli» poemasında həyata yaxınlıq, ictimai dairələrin haqsızlığının tənqidi aydın hiss edilməkdədir. Bizə belə gəlir ki, bu, Nakam yaradıcılığının mütərəqqi cəhətələrindən biri kimi qiymətləndirilməlidir.

Doğrudur, Şərq panteist fəlsəfəsinə, Nizami və Füzuli yaradıcılığına yaxından bələd olması şairi bəzən dövründən təcrid edərək keçmişə də qaytarır. Belə hallarda Nakam, öz ustadları kimi:

Hanı mina, hanı sağər, hanı mey,
Gətir cami, mənə mey ver pəya pey ...
O meydən kim, odur pərvərdeyi-ruh,
Odur tufani-qəmdə Kəşteyi-Nuh –

deyərək «mina», «mey, «sağər» kimi panteist filosofların çox tez-tez işlətdiyi söz və ifadələri təkrar edir. O, «məna şərabını» «qəm tufanında» xilaskarlıq rəmzi, Nuh gəmisi adlandırır. O, bu məna şərabını idrak sahiblərinin qəlbinə yaxşılıq bəxş eləyən, doğru yolu nişan verən «badeyi-pak» deyə qiymətləndirir:

Dilim aşüftədir, məni-bidiləm,
Əlim tut, saqiya, mey ver əliləm.
O meydən ver kim, odur badeyi-pak,
Səfabəxşi-dili-ərbabi-idrak.
Edib məni bir dəm məstü meynab,
Məni qıl ol meyi-nab ilə sirab.[11]

Nakam poemanın kulminasiya nöqtəsində, Leylinin ölümü ərəfəsində öz saqisi ilə belə söhbət edir. Görünür ki, şair öz istəkli qəhrəmanının ölümünü təsvir etmək üçün özündə mənəvi güc və qüdrət toplamaq xatirinə məna şərabını istəyir. Füzuli də Leylinin ölümünü təsvir edəndən qabaq öz saqisinə üz tutaraq:

Saqi, gözə gəldi nəşəyi-mey,
Bir neçə qədəh yerit pəyapey!
Bəzm əhlinə cami-laləkun tut,
Əmma mənə cümlədən füzun tut!
Zira ki, hənuz nimməstəm,
Qəm silsiləsinə paybəstəm.[12]

---

[10] İ.Nakam. Məcnun və Leyli. AMEA Əlyazmalar İnstitutu, M-40, s.350.
[11] Yenə orada, s.310.

[12] M.Füzuli. Əsərləri. II c. Bakı, 1958, s.216.

Nakam da Leylinin ölümündən əvvəl saqidən tələb edir ki, ona elə mey gətirsin ki, bu matəmdə ona dözüm, səbr və təmkin versin, ürəyi Leylinin faciəsinə tab gətirə bilsin. «Kədərdən qəlbini pak edən», «ürək əndişəsini» sakitləşdirən, dünyanın faydasını və ziyanını «hübbi-cahanı» şairə unutduran bir mey olsun:

O meydən vermə kim, əqlə ziyandır,
O meydən ver kim, ruhi-rəvandır.
Vəfa qıl etdiyin peymanə, saqi,
Gətir peymanəni dövranə, saqi!

Göründüyü kimi, İsmayıl bəy Nakam XIX əsr Azərbaycan poeziyasında klassik ənənələri davam etdirməklə yanaşı, həm də öz dövrünün hadisələrinə münasibət bildirmiş, dil, üslub və sənətkarlıq baxımından maraqlı bir irs qoyub getmiş, beləliklə də öz əsrinin poeziyasının zənginləşməsinə öz töhfəsini vermişdir.

## MÜQƏDDƏMEYİ-DASTANİ-MƏCNUN VƏ LEYLİ

Xərabate təəşşüqdə pəyapey
Verib hər dövrdə bir aşiqə mey.
Ani saqisi eylər məsti-badə,
Həman miqdar kəm olmuş aradə.
O kimsə təst olub oldusa bihuş,
Anı piri-muğan eylər dəraqeş.
Gəlir bir qeyri dövran, qeyri aşiq,
Çıxır bir saqiyi-məhruyi-faiq.
Qılır ol aşiqi fariq cahandan,
Alur peyman, verib peymanə andan.
Düşür axır o daxi bixudanə.
Müsəlsəl eyləyir dövran həmişə,
Xərabati-təəşşüqdə bu şişə
Qədəh bir, pir bir, meyxanə birdir,
Mey bir, bir xumdədir, peymanə birdir.
Təbəddül olmayıb bunlarda əsla,
Olur saqilə aşiqi-tazə peyda.
Həman cam eyləyib Fərhadı mədhuş,
Həman pir eylədi ani dəraquş.
Keçib bu dövr, olub dövran digərgun,
İrişdi növbəti-dövrani-Məcnun.

Məni həm eyləyən sərməst, Nakam,
Həmən meydir, həman pirü, həman cam.

## MƏCNUN İLƏ LEYLİ YEK DİGƏRİN MƏKTƏBDƏ BULDUĞU VƏ HƏR BİRİ AŞİQÜ AŞÜFTEYİ YEK DİGƏR OLDUĞU

Süxanarayi-bəzmi-nüktədani,
Bu məzmun söyləmiş bu dastani.
Ki, Məcnunə olunca eşq cirə,
İrincə dəsti zamani-dəhrə.
Anın adı idi ol dəm Qeysi-Azad,
Gəzirdi subəsu azadü dilşad.
Çü getdi məktəbə, açdı kitabı,
Ona dərs oldu ancaq eşq babı.
Görüb məktəbdə Leylinin üzarın,
Müsəlsəl kəştə zülfi-tabdarın.
Dərvnində nihan eşq eylədi cuş,
Bu cuşuşi olmadı bir növ xamuş.
Olub möhtac bir cami-nədimə,
Güzər qıldı xərabati-qədimə.
Rəvan bir saqiyi-rəxşəndə rüxsar
Gəlib verdi ana bir cami-sərşar.
Necə saqi ki, ruyi bədri-ənvər,
Necə mey rəşkbəxşi-abi-kövsər.
Necə saqi ki, qəddi dilkəş idi,
Necə mey kim, şərabi-biqəş idi.
Necə saqi ki, mehri aləməfruz,
Necə mey kim, şərari-xanimansuz.
Necə saqi ki, nur idi mücəssəm,
Müsəlsəli-zülfü, zənciri-mütəlsəm.
Necə saqi ki, bir sərvi-güləndam,
Büti-çalak, qarətkari-aram.
Edib hər cilvədə bir qəmzə dərkar,
Qılıb min işveyi-kari pədidar.
Olunca bədakeş, sərgərmi-badə,
Arada qoymadı azərm badə.
O, saqi başlayıb bir tazə nazə,
Verirdi bazə bir əndazə nazə.
Dəmadəm mehrini əfzun edirdi,
Dəmadəm nazi digərgun edirdi.
Məzə idi, noql idi həngami məsti,

Turunc ğəbğəbi, badami məsti.
Bu naz ilə, bu ətvar ilə saqi,
Bu ğənc ilə, bu rəftar ilə saqi.
Alıb Qeysin əlindən ixtiyarın,
Edib nabud aramü qərarın.
Kəməndi-eşqinə dilbəstə qıldı,
Əsirü mübtəlayi xəstə qıldı.
Meyi-eşq ilə kim, Qeys oldu dərcuş,
O şuxi məhvəşi qıldı dərağuş.
Tamaşa qıldı, gördü muy ba mu
Bu saqidir həman Leylayi-məhru.
Çıxıb ol bəzmdən Qeys sərəfraz,
Həvasın eylədi eşq ilə dəmsaz.
Ləbində virdü zikri nami-Leyli,
Dilində fikri həft əndami Leyli.
Olub Leyli də dildadə bedinson,
Vəli o aşikar idi, bu pünhan.
Olub Leyli dəxi Qeysin əsiri,
Anın Qeys olmuş idi dilpəziri.
Bəsan Qeys idi Leyli də məftun,
Vəli Qeys aşikarü Leyli məknun.
Hər iki aşiqin suzəştə cani,
Biri peyda, biri əmma nihani.
Nə rütbə ilə eylədilərsə müdara
Ki, eşqi etməsinlər aşikarə.
Vəli əsrari faş oldu cahanə,
Sədayi-təbl irişdi asimanə.
Degil üşşaqə mümkün kətmi- əsrar,
Ki olur hər dəmdə min şahid nədidar.
Qoyulsa ateşə, Nakam, əgər ud,
Olur məlum, əflakə çıxıb dud.

MƏCNUNUN AŞİQİ-LEYLİ OLDUĞU
İŞTİHAR BULDUĞU VƏ LEYLİNİN
MƏKTƏBƏ DƏVAM ETMƏYiB GÜŞƏDAR OLDUĞU

Dəruni-Qeysdə nari-məhəbbət
Olub əfzun, dəmadəm buldu şiddət.
Gedib əldən zəmami-ixtiyari,
Dilində qalmadı səbrü qərari.
Nə dəmi-məktəbdə Leylini bulurdu,
Təmaşayi-rüxilə şad olurdu.
Cəmalından anın olduqda məhcur,
Olurdu şiveyi-adabdən dur.
Çıxıb axər zühurə dasitani,
Cəhandə söylənib razi-nihani.
Dedilər kim, bulub yari-müvafiq,
Rüxi-Leylayə Qeys olmuşdur aşiq.
Firuği-eşqi axər varə-varə,
Bəsani-bədr çıxdı aşikarə.
Bilib bu halı xişavəndi-Leyla,
Nəzərdən qıldılar Leylayi ixfa.
Dedilər: «Dürr əgər olmazsa məknun,
Düşər qiymətdən, olmaz qədri əfzun».
O iki sərvlər azadə ikən,
Bulub yek digərin dildadə ikən.
Fələk göstərdi bu ləəbi-nihani,
Cüda qıldı o iki mehribani.
Budur ol çərxi-bədfərcam, Nakam!
Ki, hala etməmiş üşşaqi bakam.

## MƏCNUNUN MÜTƏHƏMMİLİ-İFTİRAQİ-LEYLİ OLMAYIB DİVANƏ OLDUĞU VƏ MƏCNUN OLUB NƏNGÜ NAMİKİ FƏDAİ-EŞQİ- LEYLİ QILDIĞI

Qılıb xərdahda pünhan mahi-Leyli,
Olub xərgə nişiməngahi-Leyli .
Görünməz oldu rüxsari cahandə,
Bilinməz qaldı ruhasa nəhaidə.
Olunca sübh Qeysi-qəmrəsidə.
Nə dərxab oldu, nə aramdidə.
Cəhanda gördü asari-ziya yox,

Şəfəq vardır, və lakin rövşəna yox.
Gəlib gördü ki, məktəbdə kəvakib,
Mürəttəb cümlə bərvəfqi-məratib.
Və lakin olmamış xurşid rəxşan,
Müəyyən bürcdən hala nümayan.
Ona ol gün keçib tirə şəbasa,
Nə əncüm cilvəkar, nə mah peyda.
Bir-iki gün dəruni purşərarə,
Təhəmmül qıldı nari-intizarə.
Ziyadə bulmadı tabü şəkiba,
Gedib qıldı məkanın guyi-Leyla.
Bulub anda iqamət, Qeys edib ah,
Şəbangah, ya səhərdah gahü bigah.
Görüb yek didərin ol iki həmdəm,
Qılırdı suzi-eşqi saz bahəm.
Gahi ah eyləyirdi, gah əfqan,
Gəhi xəndan olurdu, gəh giryan.
Bu keyfiyyət də axır oldu məlum,
Bu dövlətdən də oldu Qeys məhrum.
Sürüedü Qeys cəbrən ol məkandan,
Olundu mən Leyli dəxi ondan.
Nəsimi-sübh olub ancaq bəridi,
Kəsildi həbli ümidi-nəvidi.
Qapandı hər tərəfdən rahi-çarə,
Daxi rəh bulmadı didari-yarə.
Şüurü nəngü nami verdi badə,
Biyaban içrə qaldı o üftadə.
Edib Qeys adını axər o dilxun,
Fədayi-eşqi-Leyli oldu Məcnun.
Salahi-əqldən, adabdən dur,
Olub məcnunluğu aləmdə məşhur.
Nə yerdən kim, keçirdi ol digərgun,
Deyirlərdi ki, qoyma getdi Məcnun.
Olur getdikcə, Nakam, eşq müşkül,
Təəşşüqdə budur əvvəlki mənzil.

## MƏCNUNUN ŞƏBƏNCAHAN KUHİ-NƏCDƏ GETDİGİ VƏ RUBƏKUYİ-LEYLİ FƏRYAD EDİB BADİ-SƏBAYƏ ƏRZİ-NİYAZ ETDİGİ

Çü Məcnundən olub məhvuzi-canan,

Daxi didarə bulipz oldu imkan.
Qılıb nifrət cəhandən laubali,
Gəzirdi daima vəhşi misali.
Nə bir kəslə bulurdu üns bir dəm,
Nə olmuşdu ona bir kimsə həmdəm.
Ona kim ki, gəlib söylərdisə pənd,
Edib nalə, deyərdi pənd ta çənd.
Sözün Leylidən isə eylərəm guş,
Və illa söyləmə bihudə, xamuş!
Var idi anda bir kuhi-sərəfraz,
Ki edərdi asimanə zirvəsi naz.
O kahin olmuş idi Nəcd nami,
İrişmişdi süpehrə ehtişami.
Bu kuhin daməni idi bir gülüstan,
Edərdi rəşk ona gülzari-Rizvan.
Qılırdı bir qəbilə anda məva
Ki, bu məva idi məvayi-Leyla.
Olub nisbətlə kuhə Nəcd nami,
Qəbail içrə olmuşdu girami.
Kuzeyni-aşiqan Məcnuni-fazil,
Bəlayi-firqət ilə daği-bər dil.
Gedirdi hər gecə ol kuhsara,
Təvəccöh eyləyirdi kuyi-yara.
Həman Leyli cəmalin yad edərdi,
Həman Leyli deyib fəryad edərdi.
Qılırdı sübhədək fəryadü əfqan,
Səhərgəh ah edib, giryanü giryan.
Verib bir qeyr surət macərayə,
Edərdi ərzi-qəm badi-səbayə.
Ki, ey badi-səda, durma səfər qıl,
Sərzülfünə Leylinin güzər qıl!
Mənim könlümdür ol zülf içrə pünhan,
Saçın, keysulərin qılma pərişan.
Olub avixtə ol tari-mudən
Olub mişkin-nəfs ol mişkbudən.
Cəhani mink ilə agin eylə,
Məşami-canimi mişkin eylə!
Sarıl ahəstə bir də zülfi-yarə,
Mənim əhvalimi şərh et nigarə!
Ki, Məcnundur dili-əfkari fəraqin,
Anı dilxun edibdir iştiyaqin.

Yaxıb canü tənin nari-bəladə
Olubdur həsrətindən üftadə.
Vüsalindən sənin ta dur olubdur,
Qalıbdır xəstədil rəncur olubdur.
Ləbindən dərdinə olmazsa məcun,
Olur dərdi füzun, hali digərgun.
Mədər sən həm anın yarı degilsən?
Həvaxahı, tərəfdarı degilsən?
Ki, o möhnətdən qalmış öylə nalan,
Sən asayişcə boylə şadü xəndan.
Anı yad eyləməzsən gahi-gahi,
Nədir eşqindən özgə bir günahi?
Sən ol xürrəmdil, ey cananı-Məcnun,
Fədai -kuyin olsun cani-Məcnun.
Budur aşiqlərin, Nakam, hali.
Bəla aşiqdə xubani-laubali.

## PƏDƏRİ-MƏCNUNUN LEYLİNİ XASTKARLIĞI VƏ XİŞAVƏNDİ-LEYLİNİN MƏCNUNDAN BİZARLIĞI VƏ MƏCNUNUN TƏRİQİ-VƏHŞƏTƏ AĞAZİ-SÜLUKİ

Çü şiddət buldu dərdi-eşqi-Məcnun,
Dili-abasi oldu dərddən xun.
Əbi-Məcnun idi Amiridə ol dəm,
Əmiri-möhtərəm, miri-müəzzəm.
Qəbilə əhli qıldı ittifaqi
Ki, nabud eyləsinlər bu nifaqi.
Olub yekrəyi, yeksər Amiriyan
Ki, edib Nəcdə rəvanə gənci-şayan.
Qılıb yekdil o qövmi-mehribani,
Büti-xoşruyi-Leylayi-zamani.
Edib dər xast, qılsınlar niyayiş,
Bu müşkül əmrə versinlər güşayiş.
Pədəri kim, bəstəri-dami-bəladır,
Bəlayi-zadəganə mübtəladır.
Eşitdi validi-Məcnun bu rəyi
Bu qövldilpəsəndü dilkəşayi.
Qılıb tərki-ələm, xəndan oldu,
Cəvahirpaşü siməfşan oldu.
Təriqi-əzmə oldu tərhəndaz,
Səfəri-bərgi-nəvasin eylədi saz.

Böyüpgani-qəbilə pirü bürna,
Olub arəstə, oldu mühəyya.
Güruh başükuh ilə nəhayət,
Edib Nəcdə səfər, qıldı əzimət.
Xəbərdar oldu Nəcd əhli təmami,
Gəlib qarşıya çıxdı xavü ami.
Çü mənzilgahə irdi mehmailər.
Ədayi-xidmət etdi mizbailər.
Əzan pəs dedilər: «Ey fəxri-Amir!
Əmiri-pakdilü Miri-avamir.
Nədirsə mətləbin, söylə,
Təcavüz eyləmək andan xətadır».
Bəliğanə qılıb təqrirə acaz,
Açıb ləb dedi ol miri-sərəfraz:
«Muradım təriqi-aşinalıq
Ki, vardır bunda iki rövşənalıq».
Əbu Leylayə ol dəm qıldı izhar
Ki, Leyladən üçün gəldim tələbkar.
Cigərguşəm anın məftuni olmuş,
Anın aşüftəsi, məcnuni olmuş.
Anı bu qeyddən qılsan dilazad,
Edərsən həm məni, həm aləmi şad.
Həman dürri-səminü dilpəsəndin,
Sədaqətdə o sərvi-sərbüləndin,
Neçə gənc istərsənsə rəvandır,
Dü bəla etməsəm eyni xətadır».
Kəlamin xətm qıldı miri-Amir,
Əbu Leyli cəvabə oldu hazır.
Dedi: «Sən tək mana olmazdı peyvənd,
Əgər fərzəndin olsaydı xərədmənd.
Bu mətləb gərçi xoşdur, dilnişindir,
Ərəb əhli və leykin xurdəbindir.
Verərsəm mən əgər bu əmrə əncam,
Məni eylər məlamət xasü həm am.
Məni bu əmr ədasından məaf et,
Görüb nəqdində eybi intisaf et».
Eşitgəc amirilər bu cəvabı,
Rəhi-ricətdə gördülər səvabı.
Pərişanü mükəddər, qəm rəsidə,
Bəratü arzuyə xəttkəşidə.
Edib övdət, bulub Məcnuni-zari,

Dedilər: «Ey, bəlakeş, sən də bari
Fəramuş eylə ol namehribani
Ki, yoxdur anda əhliyyət nişani.
Qəbilə nazəninanın sərapa
Yekayek seyr qıl, eylə tamaşa.
Pəsəndin olsa hansı mahpeykər,
Səninlə olsun ol məhparə həmsər.
Nədir Leyli ki, səndən yad qılmaz,
Səni bu dərddən azad qılmaz.
O kim, səndən olubdör boylə xamuş,
Anı yad etmə sən, həm qıl fəramuş»…
Bu pəndi-napəsəndi eyləyib guş,
Xuruşan oldu Məcnun eylədi cuş.
Dedi: «Çoxdur fələkdə nəcmi-rəxşan,
Vəli anlardan olmaz mahi-taban
Zühurə çıxsa da hər nardən nur,
Hər atəşdən olurmu atəşi-Tur?
Mərizə olmasa dapu müvafiq,
Anı verməz təbibi olsa haziq.
Əgər hər nazənin olsaydı Leyla,
Olurdu cümlə həm Məcnuni-şeyda.
Anı kim, eyləmiş divanə Leyli,
O divanə edərmi qeyrə-meyli?!
Əgərçi hər pəri mişkinmudur,
Mənim çeşmimdə, əmma zişt-rudur.
Ki, mən Məcnuni-Leylayi-zəmanəm,
Nə Məcnuni, rüxi-Leyli və şanəm.
Mənəm Məcnuni-Leylayi-diləfruz,
Mənəm Məcnuni-Leylayi-cəhansuz!
Mənəm sərgəştəyi-Məcnuni-Leyli,
Mənəm divanəyi-məftuni-Leyli.
Ona isnad edirsiz bivəfadır,
Xətadır bu, xətaəndər xətadır!
Degildir o mənə bədmehr əsla,
Bəna andən deyil bu qəm ki, Leyla –
Bəna bəndən ziyadə mehribandır,
Vəli əğyardən mehri nihandır!
Anın mehrü vəfasından xəbərdar –
Olur ol kim, anın eşqilədir zar.
Bəna daxi nə cəmiyyət gərəkdir,
Nə cəmiyyətdə ünsiyyət gərəkdir.

Bəna ancaq gərəkdir künci-üzlət,
Biyabani-fəna, səhrayi-vəhşət.
Bəni fərmuş edibdir danişi-huş,
Edin siz həm bəni yeksər fəramuş…»
Sözün xətm eyləyib Məcnuni-dilsuz,
Edib bir ah aləmsuzi-dilsuz.
Qəbasın çak qıldı ta bədamən,
İrişdi daməni-əflakə şivən.
Bürəhnə oldu, tutdu rahi-səhra,
Fənaəndər fənadə buldu məva.
Gərəkdir böylə olsun məst, Nakam!
Edən bəzmi-bəladə nuş bir cam.

## MƏCNUNUN BİYƏBANİ-VƏHŞƏTƏ GETDİGİ VƏ DAMƏNİKUHDƏ MƏVA QILIB HALİ-DİLİ-NATƏVANANIN ŞƏRH ETDİGİ

Təriqi-vəhşətə çün getdi Məcnun
Edib abavü əqranin digərgun.
Bədü nik cəhandan oldu azad,
Nə niki eylər oldu, nə bədi yad.
Gəribani dəridə, daməni çak,
Gözü nəmnak, özü nalanü qəmnak.
Dəvan idi cəhanda suy ba su,
Deyib Leyli gəzirdi kuy ba ku.
Bədən üryan, cigər xun, dil rəmidə,
Edib hər dəmdə inşad bir qəsidə.
Qılırdı aşiqanə gəh təranə,
Gəhi fəryad edirdi aşiqanə.
Edənlər guş şer canfəzasın,
Sürürdü ruhbəxşi-dilguşəsin.
Qılıb əfsus, olurdu didəgiryan,
Edirdi hifz əbyatin kəmakan.
Bu növ ilə keçib ovqati-Məcnun,
Həya-huyi cəhandən oldu dilxun.
Alıb səccadəsin çıxdı kənarə,
İrişdi bir müvəhhiş kuhsarə.
O kuhin damənin qıldı neşimən,
Cülus etdi dedi: «Ah, ey dili-mən!
Nə deyim bilməm, nədir dərdim dəvası?
Nədir başımda bu sövda həvası?

O rütbə qılmışam kəmü ini, ani
Ki, bilməm daxi rahi-xanimani.
Nə kuyi-yardə vardır pənahim,
Nə yarə eyləyir təsir ahim.
Toxundu şişeyi-namusumə səng,
Şikəst oldu o şişə, qalmadı nəng.
Bəna yar olmağı yaran edər ar,
Olur bəndən məni kim görsə bizar.
Xədəngi-qəmlə dilrişəm həmişə,
Qəmi-eşqilə bixişəm həmişə.
Bana gahi deyirlər bütpərəstəm,
Gahi deyirlər xərabüftəda məstəm.
O büt kim eyləyib hər dəm sitayiş,
Bulurdum ol qədəhdən kim güşayiş.
O bütdən olmuşam məhcuri-dilxun,
Olubdur ol qədəh şikəstə əknun.
Əlimdə nə sürahi var, nə sağər,
Nə büt qalmış nəzərgəhdə, nə azər.
Bəna zində deməz bir kimsə, əlhəq,
Degilsəm də əgərçi mürdə mütləq.
Vəlakin zəxmi xurdə bir şikarəm
Ki, pabəndi-kəməndi-tabdarəm.
Bəni dərdam edib bir türki-Ləccac,
Xədəngi-məstinə qılmışdır amac.
Ana aşüftəyəm, dildadəyəm mən,
Fədası olmağa amadəyəm mən.
Mənəm məstü xərab pay dərgil,
Olurmu məstdə, aşüftədə dil?
Mərizi-dərdi-bidərmanəm, əmma
Həmarə ruzü şəb naləm, əmma
Bilən yox kim, nədir bu ahü naləm.
Bilən yox kim, nə rütbə xəstəhaləm.
Nigara olmayanlar aşiqi-yar,
Olurmu hali-aşiqdən xəbərdar?!
Mədəd, ey dust, getdi payi-tədbir,
Dəmidir, tut əlimdən, etmə təxir!
Sənin aşüfteyi-heyraninəm mən,
Sənin Məcnuni-sərgərdaninəm mən.
Sənin dərdin cigərbüryaniyəm mən,
Sənin nari-qəmin suzaniyəm mən.
Neşiməngahim etdin nari-suzan,

Tutuşdum narə, oldun damənəfşan.
Əgər olmuşsa xəşmin atəşi tiz,
Sirişkimdir əlində dəstiaviz.
Tərəhhüm eylə gör halim, nigarə!
Dönüb idbarə iqbalim, nigarə!
Qəmdən xakə düşmüş sayəvarəm,
Ləkət təhtində zarü biqərarəm.
Fəraqindən tənim olmuş surdə,
Besani-qalibi-biruhi mürdə.
Səbadən guş edərsəm bir pəyamin,
Qılır mənən bəni ehya kəlamin.
Nə yerdir mənzilin, ey nuri-didə!
Sana da zəxmi-çeşm oldu rəsidə.
Mən etdim cürm, sən məhbus oldun,
Əsiri-bənd olub, məyus oldun.
Bənəm divaneyi-bixiş, əmma
Səni zəncirə çəkmiş üzri-dünya.
Bana şayəstədir zənciri-ahən,
Əgər zülfündən olsa daxi əhsən!
Əgərçi zövqi vəslindən kənarəm,
Vəli ta zindəyəm, ümidvarəm.
Adınla cismimi həm surət etdim,
Büküldüm «Lam» tək, «ya» kimi bitdim,
İki dəstim, iki «Lami» - bəladır;
İki payim, iki piçidə «yadır».
Oxur cismim görənlər nami- Leyla
Ki, adındır iki «Lamü», iki «ya»
Verib payan bu şeri – cangüdazə,
Cərahəti-dəruni oldu tazə.
Cigər bu suzü tən bitabü dil riş,
Edib bir nalə, düşdü zarü bixiş.
Təzyid eyləyib getdikcə, Nakam,
Təəşşüqdə bəlayi-möhnət əncam.
Olur hər an bu əfsusü bu həsrət,
Olunca məhv aşqdən niyyət.

## MƏCNUN İLƏ LEYLİ YEK DİGƏRİN BİR GÜLZARDƏ BULDUQLARI VƏ FƏRTİ-İŞTİYAQDƏN TABİ-TƏCƏLLAYİ VÜSAL BULMAYIB MƏDHUŞ OLDUQLARI

Baharın türfə vəqti gül zamanı
Ki, etmişdi bahar ehya cahanı.
Açmışdı büsati laləzarın,
Edirdi nəğmə mürcani baharın.
Həzaran zarü xəndanü qönçeyi-gül,
Pərişan türreyi-gülbuyi-sünbül.
Dolurdu jalə cami-ərqüvanə,
Verirdi nəşə bəzmi-gülüstanə.
Çəkavə eyləyib əleyş təkrar
Həmavaz olmuş idi yar ba yar.
Bu mövsümdə, bu vəqti-canfəzadə,
Ki, buyi-eşq idi peyda həvadə.
Bulub şiddət dili-Məcnundə sevda,
Gəzərkən ah edib səhrabə səhra.
Səbadən guş qıldı buyi-Nəcdi,
Təzyid eylədi tüğyani vəcdi.
Olub muştaq seyri-ruyi-yarə,
Əzimət qıldı, getdi guyi-yarə.
İrişdi nagahan bir gülsitanə
Ki, qibtəbəxş idi bağı-cinanə.
Nümayan andə asari-nohüftə.
Güli-əşkufəsi yeksər şükuftə.
Qılıb aramgah cani-bülbül,
Güşadə eyləmişdi sinəsin gül.
Dolaşıb, eyləyib Məcnun nəzarə,
Baxırkən gəh gülə, gəh laləzarə,
Göründü çeşminə daği-şəqayiq,
Anı zənn etdi bir pürdaği-aşiq.
Keçib təzim ilə piramünindən,
Ədəblə bus qıldı damənindən.
Həzar zari gördü dər fəğandır.
Vəli gül qönçəsi xəndandəhandır.
Xitab etdi dedi kim: «Ah, ey gül!
Gərəkməzmi sana biçarə bülbül?
Ki, bir dəm guş qılmazsan fəğanın,

Yaxırsan nari-eşqə aşiyanın.
Məgər məşuqlərdə rəsmdir bu
Ki, olsunlar gərək daim cəfacu.
Qılıb əfqan dəmadəm eyləyib ah,
Gəzirdi subəsu gülzari nagah
Həman gülzardə gördü ki, yari,
Füruzan eyləmiş bağü bahari.
Edib gülzari firdovsi-bərin tək,
Qılır gəşt gülüstani huri-eyn tək.
O gün insaf edib etmişdi dövran,
Güruhi-aşiqə mehrin nümayan –
Ki, Leyli dəxi Məcnundən məqdəm
Olub bir neçə məhrulərlə həmdəm, .
Gəlib gəşt eyləyib ol gülüstandə,
İqamətgahani qılmışdı andə.
Görüb yek digərin Məcnun Leyla,
Müqabil oldular ol iki şeyda.
Cəmali-Leyli şəmi-məclisəfruz,
Anın pərvanəsi Məcnuni-cansuz.
Qəddi-Leyliydi sərvi-rövzeyi-can
Dili Məcnunun andə bərk- Eərzan
Lətafət Mifinin soltani Leyli,
O Misrin çeşmi Məcnun rudi-Nili.
Üzari-Leyli hüsnü an baği,
Dili Məcnundə dərdi-eşq daği
Necə Leyli ki, bir məhbubi-dilkəş,
Necə Məcnun vücudi eşqi-atəş.
Necə Leyli gülü afətnədidə,
Necə Məcnun həzar qəm rəsidə.
Necə Leyli mahi-rövşən cəmali,
Necə Məcnun sipəhri-qəm hilali.
Necə Leyli ki, sübhü aləməfruz,
Necə Məcnun ki, şəmi-xiştənsuz.
Nə Leyli məhz Məcnun idi meyli,
Nə Məcnun meyli ancaq eşqi-Leyli.
O iki aşiq muştaq məhcur,
Qəmi-həsrətdən olmuşlardı rəncur.
Bulub yek digərin qıldı dərağuş,
Həman dəm düşdülər xak üzrə bihuş.
Bəsani-mürği bəsməl Leyli zar,
Ururdu dəsti-pa naçarü naçar.

Bəsan mürdəkan Məcnun nalan,
Düşüb torpaqda qalmışdı bican.
Görüb Leylini məhruyani bədəhval,
Gəlib ətrafınə sürətlə filhal,
Yüzinə oldular abi-güləfşan,
Üfaqət buldu əmma bir də giryan,
Olub Məcnuninə cəsbidə cantək,
Dərağuş eylədi ruhi-rəvantək.
Üzarin bus edib bihuş oldu,
Təni-biruh tək xamuş oldu.
Gülabəfşan olub xuban digərbar
Qılıb bir növ ilə Leylini bidar,
Dedilər: «Ey güli-bağı –nəzakət!
Sana şayan degildir bu fəlakət –
Ki, sən bir nazənin bibədəksən,
Bədəlsiz bir mələksima gözəlsən!
Sana bu eşq, bu sevda nə layiq,
Sənin rüxsarına aləmdir aşiq.
Bu halə valideynin olsa agəh,
Səni töhmətzədə eylərlər, ey məh!»
Bu məzmun söyləyib neçə fəsanə,
Götürdülər o mahi xanimanə.
Bu sirri açmadı yaranı – Leyli
Xəbərdar olmadı əqrani-Leyli.
Üfaqətyab olub biçarə Məcnun,
Fəzayi-dərddə avarə Məcnun.
Açıb göz gördü kim, canani getmiş,
Qoyub cismin füqrdə cani getmiş.
Məlamətkuyi olub açdı zəbanin,
Nişan tiri-töhmət qıldı cananı.
«Ki, ey cani-həzin, çün vəslə yetdin,
Neçün qəflət qılıb vəqti gum etdin.
Neçün təslimi-canan olmadın sən?
Səni canansız şimdi nedim mən?
Səni mən bəsləmişdim, ey siyə kar,
Həmin olmaq üçün qurbani-yar.
Təğafül eylədin, fövt oldu fürsət,
Səninlə eyləməm mən dəxi ülfət.
Səni daxi nedim mən, gərçi cansən
Ki, canansız mənə bari-giransən.
Yenə düşdün bəlayi-iftiraqə,

Ya qıl şimdi şərari-iştiyaqə…»
Şəkibasi gəribanın qılıb çak,
Pərişanü mükəddər, zarü qəmnak.
Tutub səhra təriqin getdi muyan
Biyabangərd oldu, novguyan.
Qəmi-hicran, bəlayi-eşq, Nakam,
Qılır peyda həzaran dərdü alam
Edər aşiqləri gün-gün cigərxun,
Olur varəstə kim ki, olsa Məcnun.

## MƏCNUNİ-DİLXUNUN VEYTİ-XUDAYƏ GETDİYİ VƏ ƏSƏRİ-HƏVAYİ-DUASİLƏ ATƏŞİ-EŞQİ ŞİDDƏT ETDİYİ

Olub əfraştə Məcnun ləvasi,
Cəhanda söylənirdi macərasi.
Ki, qılmışdır biyabani müsəxxər,
Cünud eşqi-Məcnuni-dilavər.
Bulub hər dəm təzaid eşqi-Məcnun
Olurdu Leylinin hüsnü tək əfzun.
Əgərçi eşqdə Məcnuni-şeyda
Cünun mülkündə bir şah idi, əmma
Deyirdi hər zaman dilxun atası
Ki , bir kəs olmasın məcnun atası
Gəzirdi daima giryanü giryan,
Kimi görsə olurdu çarəcuyan.
Nə yerdə bir ziyarətgah bulurdu,
Rəvan ol büqədə hazır olurdu.
Qalıb aciz, pərişanhalü naçar,
Ona oldu müqərrər axəri-kar
Ki, mehrabi zəminü asimanın,
Mədari- hacəti əhli-cəhanın.
Fəqət bir Kəbeyi-ali binadır,
Məhəlli-ilticadarül ricadır.
İrişdi vəqt olub həngameyi-həcc
Oxundu hər tərəfdə nameyi-həcc.
Yazıq Məcnun atası didə giryan,

Biyabandə olub Məcnunu cuyan.
Bulub vəhşətdə ol dilxunu axır,
Gətirdi Kəbəyə Məcnunu axır.
Tutub Məcnun əlindən payə-payə,
Yetirdi sayeyi-beyti-xudayə.
Dedi: «Cani-pədər, bax bu məqamə -
Ki, şayandır həzaran ehtiramə.
Təğafül etmə, bu Beyti-xudadır.
Diləgah ol ki, cayi-ilticadır.
Tutub bu həlqeyi-beyti, dua qıl -
Ki, yarəb, sən məni qəmdən rəha qıl!
Təzərrö et ki, yarəb, qıl bəni şad.
Bəni bu eşqdən eylə dilazad!»
Edincə nami-eşqi guş Məcnun,
Edib giryə, olub dərcuş Məcnun.
Həman dəm sıçrayıb oldu rəvanə,
İrişdi həlqeyi-babi-əmanə.
Tutub ol həlqeyi-ümmidi möhkəm,
Ona rumal olub bus edirdi həm.
Niyaz etdi ki «zarəm, ya ilahi!
Dərində həlqəvarəm, ya ilahi!
Dilimdə eşqi bi payan eylə,
Nə miqdar isə, səd çəndan eylə!
Ki, bən bir aşiqi-sağər bedəstəm,
Tamaşayi-rüxi-saqilə məstəm.
Bəni bu cam ilə peyvəstə məst et,
Həmişə aşiqi-saqipərəst et!
Bəni eşq ilə mötad et, ilahi!
Dilimdə eşqi müzdad et, ilahi!
Dəmadəm hüsni-Leylini füzun et,
Bəni gün-gündən eşqində zəbun et!
Bən olsam da bəladən mu misali,
Ona bir mu qədər vermə zəvali.
Həvayi-həlqeyi-zülfün həmarə
Səmaxi-canımə qıl güşvarə!
Tənimdə daim et asari-eşqin,
Dilimdə şöləvar qıl nari-eşqin».
O piri dilşidə durmuşdu xamuş,
Edirdi naləşi-Məcnuni guş.
Yekayek guş edib razü niyazin,
Xəbərdar oldu, bildi cümlə razin

Ki, dərdi qabili-dərman degildir,
Şüuri tabei-dərman degildir.
Axıtdı gözlərindən əşki-həsrət,
Edib əfsus, agər qıdı ricət.
Tutub Məcnun yenə rahi-biyaban,
Biyabangərd oldu Leyliguyan.
Olub getdikcə dərdi-firqət əfzun,
Füzun oldu cəmi-sövdayi-Məcnun.
Mərizi-firqətə, Nakam, dərman
Vüsali-yarə yetməkdir verib can!

ƏMİRİ-NƏCD QƏTLİ-MƏCNUNƏ MÜSƏMMƏM OLDUĞUNU VALİDİ-MƏCNUN BİLİB MƏCNUN CÜSTÜ CU QILDIĞI VƏ MƏCNUNU BULUB NƏSİHƏT QILIB ƏNCAMİ-NƏSAYEHİ BİTƏSİR OLDUĞU

Bulub məqsudini Beyti-xudadə,
Biyabangərd olub Məcnuni-sadə.
Təzaid eyləmişdi eşqi guya,
Vücudi eşqə dönmüşdü sərapa.
Bulub şiddət dilində gah vəcdi,
Tuturdu bihudanə rahi-Nəcdi.
Qılıb inşadü şeri-aşiqanə,
Edirdi kuyi-Leylidə təranə.
Məlamətdən olub Leyli hərasan,
Olurdu guşeyi-möhnətdə pünhan.
Tütürdu pərdədə razi-nihanın,
Yaxırdı atəşi-Mücnunə canın,
Edirdi xeyməsində muyə Leyla
Biruni-xeymədə Məcnuni-şeyda.
Həzaran rəng ilə əfğan edirdi,
Qəbilə əhlini giryan edirdi.
Gedib ol qövmdən bir neçə qəmmaz,
Olub həmdəstü həmrayü həmavaz
Qəbilə şəhnəsinə qıldılar zad
Ki, bir aşüftəhalü amirizad,
Gəlir həmdəm qəbilə içrə nalan,
Xüruşanü sərayanü qəzəlxan.
Olur kuyində Leylinin nəvasaz,
Qəribə şerxandır, həm xoşavaz.
Edibdir namini Leylinin əzbər,

Məali-şeridir Leyli sərasər.
Olur başində cəmiyyət pədidar,
Qılır heyrətfəza həngamə izhar.
Edib Leylini məşhuri-zəmanə,
Zəbani-nasdə qılmış fəsanə.
Qəbilə əhlini bədnam edibdir,
Səni həm şöhreyi-əyyam edibdir.
Əmir tündü xunaşam qürran,
Qılafından çəkib şəmşiri-bürran-
Dedi: «Bir də o Məcnuni-pərişan,
Olursa Kuyi--Leylidə nümayan,
Gərək qanın töküb naçar anın,
Daşin eəlin edim ol astanın».
Olub bir amiri vaqif bu halə,
Rəvan oldu şitaban, qıldı nalə.
Dedi: «Ey seyidi – amir, şitab et!
Keçirmə fürsəti rayi-səvab et!
Ki, şəhnə-tundxu Məcnuni-navandır,
O xunaşamdır, bu natəvandır.
Olur Məcnunun ol dəmdə xəbərdar,
Ki, qanın safın edərlər anda naçar.
Pədərlik mehri Məcnunun atasın
Edib dilxun, o dilxunun atasın.
Tərəfdarani – Məcnun şitabın,
Bəyani-bəladə qıldı puyan
Gəzib səhradə Məcnun düstani
Təfəqqüd qıldılar ol binişani.
Nişanın bulmayıb nalanü giryan
Edib əfsus, döndülər pərişan.
Pədidar olmayıb didari-məcnun,
Qalıb nayaftə asari-Məcnun
Ənisi valideyni-ah oldu.
İqamətgahi matəmgah oldu.
Keçirkən nagahan bir rahpeyma,
Nigah etdi görüb bir mehsima.
Biyaban içrə düşmüş xakə qəntan,
Əninü bixudü bitabü nalan.
Nihali növrəsi bağî çəvani,
Yüzində hüsni-Yusifdən nişani.
Həmən bir ah idi ol mahə məhrəm,
Yox idi sayəsindən qeyri-həmdəm.

Olub aşüftəsi ol biqərarin,
Təfəhhüs eylədi əhvali-zarin.
Sədayi-ahü vaveyladən özgə,
Nidayi-ah, ya Leyladən özgə.
Müvəffəq olmadı artıq cəvabə
Necə təğyir verdisə xitabə.
Anı ol hal ilə tərk etdi naçar,
Rəvan oldu dilində dərdü əfkar.
Görüb Məcnun atasın rəhgüzərdə.
O piri buldu təşvişü xətərdə –
Ki, hali müztəribdir, çeşmi-giryan,
Biyaban içrədir, heyrətlə puyan.
Sual etdi ki, ey piri-sərəfraz?
Neçündür bu fəlakət, bu təkü taz?
O pirdilşüdə açdı dəhanın,
Qılıb izhar ənduhi-nihanın.
Dedi giryanü giryan: «Sorma halım,
Səni həm dərdnak eylər məlalım-
Ki, mən gümgərdeyi-puri-əzizəm,
Fəraqindən həmişə əşkrizəm.
O puri-dilpəsəndim bir bəladır,
Bəlayi-eşqi-yarə mübtəladır.
Anı bir şahidi-çalaku-ziba,
Qılıb yəğma, edibdir naşəkiba.
Künun adı olub sərgəştə Məcnun,
Düşüb səhralərə qalmış digərgun».
Bilib keyfiyyəti ol mərdi-hüşyar,
Sərapa haldən oldu xəbərdar.
Yaxıldı atəşi-əfsusə canı,
Xəbərdar etdi piri-natəvanı.
Müfəssəl söyləyib Məcnun nişanın,
Ona göstərdi Məcnunun məkanın.
Bilib axər o piri-dağ bərdil
Nə yerdə olduğun Məcnunə mənzil.
Dili-pürdərd, çeşmi əşkrizan,
Biyabangərd olub üftanü xizan.
Ararkən subəsu Məcnuni-zarin,
Bulub bir guşədə ol biqərarın.
Baxıb gördü düşüb bir təngnadə
Başı səng üzrə qalmış üftadə.
Gəhi giryandır, gahi dərəfğan,

Gəhi muyandır, gahi qəzəlxan.
Gəhi bəxti kimi dərxabü bitab,
Gəhi çeşmi kimi dərxunü bixab.
Çıxır əflakə hər dəm dudi-ahi,
Şərar əfşan edər əbri-siyahi.
Şərabi-eşqdən sərməstü bixiş,
Bəlayi-eşqdən rəncurü dilriş.
Nə agahdır zəminü asimandan,
Nə vaqifdir cəhandə insü candan.
Təəşşüq birlədir şüğlü həvasi,
Deyil məlumi eşqin məədasi.
Təfərrüc eyləyib Məcnuni-zarə,
Baxıb çeşmi-kərəmlə ol fikarə.
Küşadə eyləyib babi-kəlami,
Nəvazişlər qılıb, verdi salami.
Görüb məxdumini Məcnuni-şeyda,
Sərildi məqdəmində sayə asa.
Dedi: «Ey validi-vala nəvanəm,
Qəbul üzrümi kim, natəvanəm.
Görüb əhvalımı, sorma məlalım,
Qəzayə vagüzar et cümlə halım.
Tənim bitabü ahim atəşəfşan,
Gözüm xunpaşü əhvalım pərişan.
Nolaydı görməyəydin böylə halim,
Nolaydı bilməyəydin bu məlalim.
Əgərçi məqdəmindən rusiyahəm,
Siyəh ruyimlə əmma üzrxahəm.
Ki, getmişdir əlimdən ixtiyarim,
Daxi yoxdur təkimdə iqtidarim.
Görürsən ki, mənim halim zəbundur,
Sərtədbir dərkindən birundur».
Həmana validi- Məcnuni-məftun,
Pərişanü mükəddərü didəpürxun,
Verib Məcnunə yeksər guşü huşin-
Görüb Məcnunun cuşü xüruşin.
Açıb başın fəğan etdi məşəvvəş
Dedi: «Ey puri-rəncurü bəlakəş,
Sana noldu ki, boylə zar oldun,
Bəlayi-eşqdə bimar oldun?
Nədir bu ahü bu nalə, bu şuriş,
Nədir bu eşqü, bu atəş, bu suziş?!

Dəxi yetməzmi biaram olmaq,
Bu rütbə bihudə bədnam olmaq?
Kimin nifrini qılmış kim sirayət,
Səni etmiş giriftar fəlakət.
Kimin ahi sana təsir edibdir,
Səni Məcnuni-bizəncir edibdir?
Kimin çeşmi qılıb halin pərişan,
Gülüstani-cəmalin etdi pəcman?
Degil bir kəs sənin tək qəmrəsidə,
Degil bir kəs sənin tək rənc didə.
Nə düşmən tənəsindən bahəzərsən,
Nə eylərsən bu bəndərdən güzərsən.
Olub ənduhdən getdikcə bədhal,
Bəni həm eylədin bərgəştə iqbal.
Yetər bu arzui-nabəhəngam,
Dəxi bəsdir bu əfsusi-bədəncam.
Yetər qəmxarlıq bu payə bəsdir,
Yetər naçarlıq bu payə bəsdir.
Ki, rahi-eşq afətdir, bəladır,
Bəlasi, afəti namüntəhadır.
Həzərat çahə var, bu rah içrə,
Həzar üftadə var hər cah içrə.
Xilas olmaq degildir mümkün ondan,
Qalır üftadəsi məhcur candan.
Əmiri-Nəcd edibdir qəsd canın,
Olar bir gün tökər, əlbəttə, qanın.
Saqın andən, cəfasından həzər qıl,
Saçın andən, cəfasından həzər qıl,
Dəxi durma, bu vadidən güzər qıl.
Əgər cuşişsə, biməhbub bəsdir,
Və gər guşişsə, bimətlub bəsdir.
Yetər möhnət, yetər həsrət, yetər dərd,
Yetər, olma dəxi bica cəhangərd.
Yetər, bihudə nalan olma daxi,
Hədidi-sərdkuban olma daxi.
Nədir bu məst olmaq Camü Cəmsiz?
Nədir bu bütpərəst olmaq səkəmsiz?
O məhbubun qəmindən eylə fəryad –
Ki, hərgiz o dəxi qılsın səni yad.
Sənin əşkalını ta ruzi-həsrət.,
Güşad etməz bu hamunu bu vəhşət.

İrişməklə muradın vəsli-yarə,
Cünuni tərk qıl, çıx bir kənarə!
Həmavaz olma eyşisəxtlərlə,
Ənis ol daima xoşbəxtlərlə!
Bəsa ümidi-ganbəxşü fərəhza,
Olur namürdlik içrə hüveyda.
Bulub əhli-cəhan sərvətlə şöhrət,
Olur aləmdə bir sahibi-fəzilət.
Olur sərvətlə hər müşkül güşadə,
İrir dövlətlə hər kəs hər muradə.
Səninçün axər, ey puri-yeganə!
Mühəyya qılmışam neçə xəzanə.
O gəncə sahib ol da, kamran ol,
Olub məqsudə vasil şadman ol!
Nəşiməngah edib bir gülüstani,
Fərahəm qıl güruhi-dustani.
Edib alami-hicrani fəramuş,
Olub bir nazənin ilə həmağuş,
Həmişə şadman ol, meygüsar ol,
Nə atəşdə yaxıl, nə dağdar ol!»
Bəla pamali Məcnun pərişan,
Bu pəndi guş edib oldu xüruşan.
Dedi: «Ey validi-vala məqamım,
Mətan əkrəmim, şahi-giramım.
Vücudim payidar olmuş səninlə,
Həyatim aşikar olmuş səninlə.
Həmişə dərgahindədir qibləgahim,
Dərindir məlcəim, sənsən pənahim!
Sanadır istinadım hər məkanda,
Vücudim olmasın sənsiz cəhanda.
Bəna qıldın güşadə gənci-pəndin,
Bəyan etdin dəvasın dərdməndin.
Nə edim, əmma ki, mən bi ixtiyarəm,
Zəbunəm, bidiləm, bi iqtidarəm.
Əgər olsaydı bəndə bəndə rişteyi-kar,
Edərmidim bəni bən aşiqi-zar?
Bən etməzdim bəni böylə digərgun,
Bən etməzdim bəni Məcnuni-dilxun.
Nəsibi hər kəsin olduqda qismət,
Bənim də qismətim olmuş bu möhnət.
Bənəm pabəndü bəndim ahənindir,

Güşad olmaz ki, hüblül mətindir.
Bu atəş içrə kim, suziştəyəm bən,
Bu atəşdən yaxılmış neçə xərmən.
Nə ancaq bir bənəm möhnətrəsidə,
Bənim tək vardır min dərddidə.
Təəşşüq çün degildir ixtiyari
Məlamət eyləmə üşşaqi bari?
Gəhi tərif edib qəm macərasın,
Gəhi təqrir edib eşqin cəfasın
Gəhi şərh eyləyib asudəqandan,
Meyü məhbubdən, zövqü cəhandan.
Kəlami ətf qılma tiği-tizə,
Küdurət vermə üşşaqi-əzizə!
Ki, aşiq tiğdən olmaz hərasan,
Degildir bimi-can üşşaqə şayan.
Fədayi-tiği-canan olmayan sər –
Olunsun tək sizayi-tiği-digər.
Bəni məzur tut zövqi-cəhandan,
Bəni əfv eylə seyri-gülüstandan.
Bana söylə hədisi-aşinayi,
Bəna tərif qılma məsavayi.
Ki, bən bir aşiqəm, bir mübtəlayəm,
Həmişə talibi-dərdü bəlayəm.
Bu möhnət kim, bəni qılmış əhatə,
Məcalım qalmamışdır inbusatə.
Olub möhnətdən atəşgəh dərunim,
Dərunim atəşi yaxmış birunim.
Fəzayi-dərddə pa dərgiləm bən,
Bu dərd ilə, bu qəm ilə xoşdiləm bən.
Salahimdən bənim qəti-nəzər qıl,
Bəni bu halimə tərk et, güzər qıl!»
Edib Məcnuni guş ol piri-dana,
Digərgun etdi göftarın həmana –
Ki, Leyli xanəmizdə mehmandır ,
Aninlə xanəmiz firdövesandır.
Sənədir müntəzir ol sərvi-dilbənd,
Sənin didarınadır arzumənd.
Edib məhbubi namin guş Məcnun,
Rəvan oldu rəvan məsrurü məmnun.
Bu tədbir ilə Məcnunun atası,
Olub Məcnuni-zarin pişvazı.

Firib ilə gətirdi ganimanə,
Anı təslim qıldı dustanə.
Görüb Məcnun ki, yox Leylisi andə,
Olub bisəbrü bidil xanimandə.
Təəllüq qeydin etdi parə-parə,
Yenə qıldı əzimət kuhsarə.
Nəşimə neylədi möhnət hasarın,
Müsəxxər eylədi vəhşət diyarın.
Giriftari-bəlayi-eşq, Nakam!
Olur aləmdə Məcnuni-biaram.

## LEYLİNİN NƏHANİ İZHARİ-İŞTİYAQ EDİB MÜNTƏZİRİ-PEYAMİN MƏCNUN OLDUĞU VƏ MƏCNUNDƏN TƏHSİLİ-PƏYAM ETMƏYƏ ƏŞARİ-AŞİQANƏSİN VASİTƏ QILDIĞI

Səbahət Kişvərinin padşahi,
Vəcahət çərxinin tabəndə mahi.
Nihali-bağİ-firdovs nikuyi,
Güli-gülzardən xubruyi.
Nəzakət bürcünün rəxşan süheyli,
Zəmanın nazənini, yəni Leyli.
İki Keysusi zənciri sərazir,
Müqəyyəd andə dəsti-əqlü tədbir.
Təbəssümdə iki Ləli-şəkərriz,
Təkəllümdə dəhani şəkkəramiz.
Müqəvvəs qaşları mehrabi-xuban,
Mükəhhəl gözlərində fitnə pünhan.
Zənəxdanıdı çahi-sərguşadə,
Həmin çah içrə min dil üftadə.
Müsəlsəl kiysuvani ənbərəfşan,
Dili Məcnun məhzun tək pərişan.
Dilimdə suzi-dərdi- eşqi-Məcnun,
Dəruni pərdədə qalmışdı məhzun.
Seyr ba məh çıxırdı gah pünhan,
Baxırdı subəsu ətrafə heyran.
Edirdi cüstu cu Məcnuni-zari –
Ki, görsün, bəlkə, ol aşübkari.
Ona dərdi-dilin təqrir qılsın,
Hədisi-firqəti təfsir qılsın.
Edərdi gəh nəsimə ərzi-əhval,

Deyirdi: «Ey nəsimi-ənbərinbal!
Vəzan ol, canibi-səhrayə bir dəm,
Bərabər türrəmin buyun gətir həm.
Bulub Məcnuni şərhi-dastan et,
Mənim əhvalimi bir-bir bəyan et!
Hərasindən rəqibi-bədnəhadın,
Qılıb puşidə dərdi-eşqi-zadın.
Bəsani-şəmidi xəndan fəruzan,
Bəsan mum idi, sayə suzan güdazan.
Fəqət bir sayəsiydi qəmküsari
Yox idi sayəsində qeyri yari.
Tökürdü gözlərindən əşki-alin,
Edirdi sayəsində şərhi-halin.
Mədar olmaq üçün gahi fəğanə,
Qılıb peyda digərgun bir bəhanə.
Sərir duk ilə dəmsaz olurdu,
Edib əfğan nəvapərdaz olurdu.
Gəhi xatir müşəvvəş, didə bər rah,
Nəhuftə nimeyi şəbdə qılıb ah.
Müxatib eyləyib Məcnuni hər dəm,
Edirdi zikri namin həmdəmi-qəm.
Qəmi-dirinəsin şərh eyləyirdi,
Töküb xunabə dərdin söyləyirdi.
Ki, yara, deməgil biçarə Leyli,
Dili sədparə, bəxti qarə Leyli!.
Sənin eşqində digərgun deyildir,
Sənin tək ol dəxi Məcnun deyildir.
Fəraqin möhnətindən dərdməndəm,
Nə edim, əmma əsirəm, payi-bəndəm.
Səni dildar edib oldum giriftar,
Künun bəndə nə dil vardır, nə dildar!
Əgər olsaydı məndə ixtiyarım,
Əgər olmuş olaydı bəxt yarım.
Səninlə gəşt edib səhrabasəhra,
Sana peyru olurdum sayəasa.
Şəbangahan qılıb puşidə əfğan,
Qalırdı didə bərrəhi sübhgahan.
Olurdu müntəzir peyğamə hər bar,
Ki, andan kim güzər qılsaydı naçar.
Həman Məcnun sürudindən şənidə
Sərayəndə olurdu bir nəşidə.

Əsirü məstüməndü zari-Leyli,
Həzinü həsrətü dildari-Leyli.
Edirdi guş Məcnunin kəlamin,
Kəlamində bulub buyi-pəyamin.
Cəvabində qılıb əşar inşa,
Fəsihü bikirü məzmun ruhbəxşa.
Edib bəhrir, atırdı rəhgüzərə
Alıb hər kəs, gedirdi kuhsarə.
Bulub səhradə Məcnuni-qəribi,
Oxurdu andə ol şeri-əcibi.
Bədahi söyləyib Məcnun nəzirin,
Edirdi münkəşif sirri-zəmirin.
Anı hifz eyləyib qasid kəman,
Olurdu kuyi-Leylidə sərayan.
Bu təqrib ilə ol iki yeganə,
Olurdu yekdigərilə həm tərанə.
Qılıb yek digərə təbliği-peyğam,
Bulurlardı qəmi-firqətdə aram.
Keçib bir dövr böylə dövri-dövran,
Bu sirri bildi axər bəd seklan.
Bu pünhan bəhs düşdü göftguyə,
Çəkildi pərdə ruyi-arzuyə.
Fələk, Nakam, əduovu aşiyandır,
Güruhi-aşiqə namehribandır.
Görürsə aşiqi bir ləhzə xəndan,
Olur viran anı etməzsə giryan.

## NAZİMİN DÖVRİ-DÖVRANDAN GİLEYMƏND OLDUĞU VƏ QƏZAYƏ TƏSLİM OLUB XALİQİ-DÖVRİ-ZƏMANƏ ƏRZİ-NİYAZ QILDIĞI

Fəğan, ey çərxi-bədmehrü bədəndiş,
Ki, nişan eyləyir üşşaqi-dilriş.
Təzayid eyləyib gün-gün inadın,
Şərarəfşan olur nari-fəsadın.
Nə yerdə var isə bir sahibi-dil,
Fəsadindən qalıbdır paydərgil.
Nə yerdə var isə əhli-məhəbbət,
Edərsən bəsteyi-zənciri-möhnət.
Qılıb naqabili pərvərdeyi-naz,
Edib bihasili səbzü sərəfraz.

Edirsən mehr kim naqabil olsa,
Qılırsan lütf kim bihasil olsa.
Sənin dövrün, sənin üzri-nihanın,
Sənin kinin, sənin cövri-giranın.
Verər naəhlə bəxtü rəxtü izzət,
Edər hal əhlini pamali-zillət.
Fəğan, ey səqfi-möhnəti-zayi-qəddar.
Ki, cövri-inqilabındır dilazar.
Olub peyvəstə dövründən pərişan,
Cəhandə olmadım bir ləhzə xəndan.
Ədəmdən gəldim ol dəm kim, vücudə,
Qədəm qoydum bu səhrayi-şəhudə.
Bəni məhdi-bəladə zar qıldın,
Tənim xəstə, gözüm xunbar qıldın.
Gəhi muyanü, gahi əşkrizan,
Mərahil tey edib üftan xizan.
Şəbabət həddinə oldum rəsidə,
Sükunim damənin qıldın dəridə.
Edib könlüm giriftari-məhəbbət,
Bəni qıldın əsiri-dami-möhnət.
Keçib möhnətlə ömrüm ünfiani
Bəna təlx oldu abi-zindəgani.
Bahari-işrətim asari-hala,
Dilimdə etmədin bir nəşə peyda.
Xəzani-möhnətin oldu pədidar,
Bu möhnətdən nə gül qaldı, nə gülzar.
Bəni tiri-qəmə amac qıldın,
Bəhar ömrümü tarac qıldın.
Verib hər dəmdə bir gunə işkəncə,
Yetirdin ömrümü pəncaho-pəncə.
Vücudim mülkünü tutdu fəsadın,
Vəzan oldu dəbir etisadın.
Tənim xoş, rəngim ikən ərğəvani,
Təbəddül buldu, oldu zəfərani.
Ağardı bərflə kuhi-siyahim,
Hərarətdən düşüb sərd oldu ahim.
Müfərrəhdir gülüstani cəvani,
Həzarbəxş olursa nəğməxani.
Tənim iqbalim əmma vumasa
Qalıb biquleyi-qəflətdə muya.
Kədərdən, dərddən fərq etmədim bən,

Nə vaxt açdı, nə dəm soldu bu gülşən.
İnadi payidarın şiddətindən,
Fəsadi-nagüvarın şiddətindən.
Açıb göz bagrımı qan görmüşəm bən,
Bəni böylə pərişan görmüşəm bən.
Deyil tedadə qabil dərdi-dövrün
Ki, tündbadi cövrün, kərdi-dövrün.
Büllur balinişim qıldı mükəddər,
Bəni etdi cəhandə zarü tüztər.
Kənun bir piri-bitabəm, zəbunəm,
Bəlayi-gərdişindən bağrı xunəm.
Dəxi etmə cəfa mən binəvayə
Ki, artıq qalmamış tabim cəfayə.
Yetər bidad isə bu payə bəsdir,
Demə bu bikəsü bidadirəsdir.
Əgər bir ah edərsəm sübhgahan,
Yaxar səqfin, səni eylər pərişan.
İrişdi qeybdən nagah peyğam
Ki, ey fərsudeyi-alam Nakam!
Fələklə bu cidalın narəvadır
Ki, ol dəxi sənintək binəvadır.
Deyil xudkamə dövrani süpehrin,
Deyil xudrayi-seyri-Mahü Mehrin.
Süpehrin yoxdur əldə ixtiyari,
Nə dövr eylərsə, eylər iztirari.
Süpehri Mehri Məh fərmanbər andır,
Həmişə dövrdə sərgəştəqandır.
Nə vardır Mahü Mehrin iqtidari,
Nə çərx vajgünun ixtiyari.
Ki, edib dövründə ibrazi-inayət,
Qılıb seyrində izhari-ədavət,
Kimə mehr eyləsə məmnun qılsın,
Kim mehr etməsə məhzun qılsın.
Edib bihudə izhari-təzəllüm
Fələklə etmə ümmidi-tərəhhüm.
Fələkdir danişü idrakdən dur,
Fələkdir daima dövründə məcbur.
Təvəqqə eyləməz aqil fələkdən
Ki, olmaz bir əməl hasil fələkdən.
Hüsuli-kamin et həqdən təmənna
Ki, oldur xaliqi-həyyu təvana.

Anın əmrinədir tabe fələklər,
Onadır bəndə kövkəblər, mələklər.
Olub, Nakam, müstəsləm qəzayə,
Əzimət eylə xətmi-macərayə.
Edib pirastə Leyli-cəmalin,
Bəyan et, şərh qıl Məcnun kəmalin.

## BİR EYBCUYİ-NAHƏMVAR LEYLİ CƏMALİNƏ İZHARİ-TƏƏRRÜZ ETDİGİ VƏ MƏRUZÜ TÖHMƏT İTAB OLUB CƏZASINA YETDİGİ

Təəşşüq eyləyib Məcnun
Biyaban içrə kim, etdi digərgun.
Olub aləmlərin virdi-zəbani,
Cəhandə söylənirdi dasitani.
Ki, Leylayə olub dildadə Məcnun,
Olubdur eşqdən üftadə Məcnun.
Olub Leylayə məftunü şəəfnak,
Edib damani-nəncü namini çak.
Biyabangərd bitədbir olubdur,
Künun Məcnun bizəncir olubdur.
Qılıb Məcnunun axər eşqi şiddət,
Bulub aşiqliyi aləmdə şöhrət.
Bilənlər eşqdə Məcnun kəmalin,
Edibdi arzu Leyli cəmalin –
Ki, bir dəm eyləyib röyəti-o mahi,
Cəmali-dilkəşin görsün kəmahi.
Təmami-əhli-cəhan bu arzudə
Təkapu eylər ikən cüstucudə.
Həramində olub Leyli xuraman,
Edirdi gəşt bir gün sübhgahan.
Görüb bir eybcu ol mahi nagah,
Cəmalin seyr qıldı dedi: «Ey mah!
Sənin eşqindən olmuş zar Məcnun,
Sənin hüsnün anı etmiş digərgun.
Tutubdur şöhrəti-hüsnün cəhani,
Vəli yox səndə ol hüsnün nişani.
Cəhandə var ikən səndən kiküru,
Büti-siminbədən məhbubi-dilcu.
Nə üçün bilməm sənə biçarə Məcnun,
Olub dildadə olmuşdur gicərxun?

Bu göftari ki, Leyli eylədi guş,
Olub zahir ləbində xəndeyi-nuş.
Dedi: «Xamuş, sən Məcnun deyilsən!
Bəlayi-eşqdən dilxun deyilsən!
Görür Məcnun həman hüsnü ki məndə,
O hüsnü görməyə yox didə səndə.
Ki, sənsən surəti-əşkalə talib,
Vəli Məcnundur əhvalə racib.
Görürsən qəddi sən şəkli əyandə,
Vəli Məcnun görür min cilvə andə.
Görürsən sən mücərrəd tari-zülfi,
Vəli, Məcnun görür əsrari-zülfi.
Görürsən sən fəqət siymayi-çeşmi,
Vəli Məcnun görür iymayi-çeşmi.
Görürsən sən həmin cürmin dəhanin,
Görür Məcnun anın sirri-nihanın.
Mənim hüsnüm sana olsa hüveyda,
Olursan sən dəxi Məcnuni-şeyda».
Edib guya təsadüf bu məqalə,
Münasib söyləmiş vəhşi bu halə:
«Əgər bər dideye-Məcnun-neşini,
Becoz əz xubiye Leyli nəbini».
Məhəbbətdən qılıb bir şammə təqrir,
Bu əsrari ki, etdi Leyli təfsir.
Olub ol eybcu xarü pərişan,
Mükafatın bulub getdi peşiman.
Həzaran işveyi-canbəxşi mübhəm?
Cəmali-mahvəşlərdə dəmadəm.
Edər cilvə, olur, Nakam, peyda,
Görür ancaq üşşaqi şeyda.

### LEYLİNİN FƏSLİ-BAHARDƏ SEYRİ-GÜLÜSTAN QILDIĞI VƏ AVAZİ-NƏŞİDEYİ-MƏCNUNİ GUŞ EDİB PƏRİŞAN OLDUĞU

Həzar nəğməsənci-gülşəni-raz,
Edibdir böylə bir gülşəndə avaz –
Ki, bir dəm kim, bəhari-aləmara
Cəhani eyləmişdi cənnətasa.
Qurulmuşdu xəyami laləzarın,
Rəvac olmuşdu bazarı baharın.

Döşənmişdi çəməndə fərşi-əxzər,
Dirəxtəni-səbzpuş olmuşdu yeksər.
Çəmənzar içrə əzhari-müləvvən
Çəmən fərşini qılmışdı müzəyyən.
Gülü məhzuz edib fəryadi-bülbül,
Olub xəndan açılmışdı rüxi-gül.
Görüb susən səfayi-gülüstani,
Təhəyyürdən tutulmuşdu zəbani.
Səfayi-cünbüşi-sərvi-sənubər,
Tərəbəngiz idi, həm ruhpərvər.
Edirdi dağini izhari-lalə,
Qoyurdu mərhəm ol dağ üzrə jalə.
Səba pünhan dolaşıb gülüstani,
Edirdi dəmbədəm gübu cahani.
Edib pərvaz mürcani xoşavaz
Olurlardı həvadə ərğanunsaz.
Gülnar eyləyib bağı çirağan,
Besani-atəş olmuşdu firuzan.
Neşimən eyləyib şaxi-çinari,
Edərdi nəğmeəyi-gu, gu qumari.
Bəşövşə pişi-güldə dəsti-bəstə,
Çəkib saf durmuş idi dəstə-dəstə.
Çəmənlər piri əbyəzpuşi-zənbəq,
Verirdi həlqeyi-əzharə rövnəq.
Görənlər rəngü buyin ərğəvanın,
Edirdi yad Cəmşidin zəmanın.
Açıb keysulərin bağ içrə məhzun
Pərişan eyləmişdi bidi-Məcnun.
Rüxi-Leyli kimiydi güli-diləfruz,
Həzaran ah Məcnun tək cəhansuz.
Olub gülşəndə xəndan Leyli gül,
Edirdi naleyi Məcnuni-bülbül.
Bu vəqt dilkəşü fərrux-nişandə
Ki, hər kəs zövq edərdi gülüstandə.
Dəruni-pərdədə künci-xəfadə,
Qəmi-firqətdə, zindani-cəfadə.
Olub diltəng Leylayi-vəfadar,
Gülüstan seyrinə oldu tələbkar.
Ki, bir dəm seyr qılsın gülüstani,
Nədir görsün həzarin dastani.
Xərəməndə olub bağ içrə sərməst,

Qəddi şümşadü sərvi eyləsin pəst.
Qılıb keysulərini ənbərəfşan,
Nihadi-sünbülü etsin pərişan.
Nigahi-məsti dər kar qılsın,
Bürəhnə nərgisi bimar qılsın!
Səriri-bağdə aram tutsun,
Dəmadəm ərgəvani cam tutsun.
Olub mürğani-bağ ilə həmavaz,
Qılıb gəh bülbülə, gahi gülə naz.
Edib təqrir dərdi naşəkibin,
Fəğanin sakit etsin əndəlibin.
Nümayan eyləyib hüsni-nihanın,
Ləbin, qəddin, ruxin, zülfün, dəhanın.
Çəmən bazarinin pozsan rəvacın,
Gülüstan mülkünün alsın xəracın.
Xəta etdim ki, ol məhbubi-yekta
Degildi maili-seyrü tamaşa.
Qərəz, seyri-səfayi-gülüstandən,
Bu idi qayyəti-məqsudi andən –
Ki, etsin gəşti- gülzari bəhanə,
Çıxıb təşrə, gedib bir gülüstanə,
Bulub gülşəndə bir künci-nihani,
Anıb Məcnuni-zari-natəvani.
Dəmadəm ahin atəşbar etsin,
Töküb qan, naləsin təkrar etsin.
Edib bir bülbüli-sərməst peyda,
O bülbül ilə qılsın nalə yekca.
Hədisi firqəti təfsir qılsın,
Qəmi-dirinəsin təqrir qılsın.
Ki, şayət eyləyib ahi sirayət,
Olur ki, fəth olur babi-inayət.
Edər cənbuş nəsimi-gülüstanin,
Bular Məcnunun buyi-nişanin.
Olar peyda dəruninde məsərrət,
Bular xiffət dilində dərdi-həsrət.
Təzərvi-rövzeyi-rizvan Leyli,
Çirağı-dideyi-xuban Leyli.
Qəbilə nazəninanilə yekdil
Rəvanə oldular mənzilbəmənzil.
Var idi andə bir bağı-dilara,
Ki, bağı-Ədənə idi qibtəbəxşa.

Necə baği fərəhbəxşa ki, bir an,
Degildi dövri-cövründən pərişan.
Xəzandən görməmişdi hərgiz azar,
Gülün seyr etməmişdi çeşmi-əğyar.
Edib fəryad səhnində həzaran,
Olurdu qönçə xəndan, əbr giryan.
Hərəmin dərdi-namin naşənidə
Hərəmində müqimi arəmidə.
Şəqayiqdən çəkilmişdi həsəri,
Səmənzar idi tərfi-cuyibari.
Dəraxtani-dilavuzü sərəfraz,
Çəkavə şaxsarində nəvasaz.
Nəvapərdaz mürğani xoşəlhan,
Səba bərgi-gül ilə dəstiəfşan.
Həvasi sulcan, kuyi narinc,
Həvasində nümayan buyi-narinc.
Səri-ənguştini ənnabi-mərcub,
Ərusi-tazə tək etmişdi məxzub.
Bənövşə payi-güldə sərnəhadə,
Ləbi-püstə təbəssümündən güşadə,
Təranə eyləyirdi abi-cari,
Bəsani-Kövsər idi cuyibari.
Həyazi içrə mahilər şənavər,
Fəzasində təzərvani-behcətavər.
Gülü bülbüllərin əşkilə seyrab,
Səri-keysuyi-sünbül tab dər tab
Üzari-ərğuvani qazələnmiş.
Hənayi-pənceyi-gül tazələnmiş.
Nə sədri-laləsində rəncdən dağ,
Nə tərfi-gülşənində naleyi-zağ.
Açıb əzhari-rəngarəng hər yan,
Büsati-səbzəsin etmişdi əlvan.
Zəmini idi sərasər əmbəramiz,
Həvasi canfəza, səhni dilaviz.
Pəriruyan ilə Leyli xuraman
Necə kim, əncüm içrə mahi-taban.
İrişdilər o baği-dilnişinə.
Anı döndərdilər xüldi-bərinə.
Dolaşıb bağdə tavusasa
Edərlərdi gəhi seyrü təmaşa
Neşimən eyləyib gəh payi-sərvi,

Təmaşa eyləyirlərdi təzərvi.
Qərənfil çin olub gəh, gah nəsrin.
Olurlərdi gəhi xəndan- gülçin.
Çinarın sayeyi-məhdudi gahi
Olurldu anların aramgahi.
Biri hər dəm edib Davudi-əlhan,
Olurdu digərani dəstəfşan,
Büti-xəndanlərlə iztirari, .
Edib Leyli də bir dəm xəndəgari,
Olub anlarlə dəmsazü həmavaz,
Qılıb min işveyi-sərbəstə ibraz.
Verib rövnəq dəmadəm ənbusatə,
Edib məşğul yaranın nişatə.
Nəhani bəzmdən çıxdı kənarə,
Gedib pünhan kənari-cuyibarə.
Qılıb bir sayeyi-sərvi nişimən,
Çəkib nalə, edib ağaz şivən.
Deyirdi: «Ey bənim Məcnuni-zarim,
Vəfadar aşiqim, dilxəstə yarim!
Əsirəm sən kimi bən həm bəladə,
Sənintək sabitəm rəsmi-vəfadə.
Bənimtək sən də olmuşsan giriftar,
Bənə aləmdə bir sənsən səzavar.
Nə edim əmma ki, dövran biamandır,
Sənə düşmən, bənə namehribandır.
Fəğan etdikcə bu gülzardə bən,
Nolaydı guş edib fəryadımı sən,
Gələydin sən də bu bağı görəydin,
Dərunimdə nihan dağı görəydin.
Gülə qarşı olubdur şad bülbül
Tərəbdən eyləyir fəryad bülbül.
Olur gül ləhni-bülbüldən şükuftə,
Bulurlar vəsldən zövqi-nəhuftə.
Nolur pərviz qıl bu gülüstanə.
Mənimlə yar olub eylə təranə.
Bənimlə həmnişin ol sən də bir dəm,
Bəni qıl qönçə tək xəndanü xürrəm.
Kərəm qıl, ey səba, durma, vəzan ol,
Rəsuli-aşiqi-bixaniman ol!
Bulub Məcnunimi məndən səlam et!
Neşiməngahi-səngin estilam et!

Mənim dərdi-dərunim şərh eylə,
Edib dərmanini təqəbbül söylə.
Ki, ey suzani-nari-dərd Məcnun,
Dili-atəşdə ahi sərd Məcnun.
Giriftarın, əsirin Leyliyi-zar,
Qalıbdır möhnəti-firqətdə naçar.
Sana müştaqdır biçarə Leyli,
Səni cuyandır avarə Leyli.
Tərəhhüm eylə bir də ol fikara,
Anı yaxma şərari-intizara.
Edib əhvalimi izhar bir də –
Bəyan et, yalvarıb təkrar bir də –
Pejmani-qəmi-hicran Leyli.
Sənin eşqində sərgərdan Leyli.
Gəlibdir bağə buyin güldən alsın,
Səni sorsun xəbər bülbüldən alsın.
Olub bu bordi-gülzarə vüsalim
Bu gülzarə gəlib görsün cəmalim.
Dəmadəm nuş qılsın kami-camin,
Qəmi-firqətdən alsın intiqamin.
Bənimlə söyləsin dərdi-dərunun
Unutsun cövrünü dövrani-dunun.
Məgər yoxmu dəxi Leylayə meyli
Ki, etməz arzuyi-vəsli-Leyli.
Qılıb əfqan, tökürdü əşki-alin,
Səbayə söyləyirdi dərdi-halin.
Kəlamin etməmişdi xətm hala –
Ki, oldu tazə bir həngamə peyda.
Edib ətrafdən bir şəxs avaz,
Dəmadəm eyləyib avazasin saz.
Güzidə bir qəzəli-mətbui-mövzun
Ki, etmişdi ani inşad Məcnun.
Qılıb əhvali-Məcnuni nümayan
Ki, ey qarətkari-səbrü qərarım,
Göründün bir gəz, aldın ixtiyarım.
Kənun dərdi-fəraqindən nazarəm,
Yenə ancaq sənə ümidvarəm.
Yanır atəşdə canim gahi-bigah,
Əsər etsən əgər vəqtidir, ey ah!
Ki, Məcnundur giriftari fəlakət,
Edir gülzarilərdə Leyli işrət.

Biyaban içrədir Məcnun pərişan,
Xiyaban içrədir Leyli güləfşan.
Dili Məcnunin olmuş parə-parə,
Vəli Leyli edər əğyarə çarə.
Fəzayi-qəmdə Məcnun dili rəmidə,
Səriri cəmdə Leyli aramidə.
Bəlayi-eşq ilə Məcnun qərindir.
Kim ilə Leyli aya həmnişindir.
Olub Leylinin eşqindən cigərxun,
Qalıbdır atəşi-möhnətdə Məcnun.
Edib Məcnuni dərdami-Leyli,
Necə, yarəb, bulub arami-Leyli.
Bu şeri-dilkəşi Leyli edib guş,
Gözündən əşki-həsrət eylədi cuş.
Sirişkilə qılıb gülzari gülgun
Çəkib əfğan deyib Məcnun-Məcnun!
O rütbə ah edib dərcuş oldu,
Ki, torpağə düşüb bihuş oldu.
Biri ol mahvəşlərdən nəhani,
Edərmiş seyr Leylayi-zəmani.
Baxıb eynəlyəqin qıldı təmaşa.
Görüb əhvalini bildi ki, Leyla
Ki, Məcnunə nə rütbə Mehribandır,
O Məcnunsə, bu Məcnunsandır.
Olub axər çəmən seyri nəhayət,
İrişdi aqibət həngami-ricət.
Edib piçində tumari-nişati,
Götürdülər büsati-ənbusati.
Həmalər əzm qıldı aşiyanə,
Rəvanə oldu xubai xanimanə.
Olub onlarlə həm Leyli xuraman,
Dəruni-xeyməsində oldu pünhan.
O məhvəş kim, görüb Leylini giryan,
Nəhan dərunin bilmişdi kəmakan.
İrişdi mənzilə aşüftəəhval
Nəhəftə tutmayıb ol sirri filhal –
Hüzuri-madəri-Leylayə getdi,
Nə görmüşsə ani təqrir etdi.
Dedi: «Leylidən artıq olma qafil
Ki, Leylidir giriftari-səlasil.
Əlac et dərdinə andən məqdəm,

Ki, ani eşq etməsin Məcnunə həmdəm.
Bilib bu macərayi ümmi-Leyla.
Qəriqi-bəhri-dərd oldu sərapa.
Dedi: «Fəryad kim, müşkü bəladır!
Bəlayi-eşq dərdi-bidəvadır.
Əgər xudsər edib Leylayi-zari,
Ona təslim edərsəm ixtiyarı.
Olur Məcnundən aşüftə hali.
Düşür səhralərə Məcnun misali.
Vəgər etsəm nəsihət kim vəqur ol.
Həzər qıl eşqdən peyvəstə dur ol.
Verib dil, aşiq olma, hüşyar ol,
Məlamətdən, nədamətdən kənar ol!
Bu pənd içrə əyandır əmr düşvar,
Deyil məqbul bu pəndi-dilazar.
Bu gunə pəndin olmaz etibari,
Ki, aşiqlik deyildir ixtiyari.
Deyərsəm sabir ol, bu həm xətadır,
Ki, üşşaqə səbur olmaq cəfadır.
Neçə tədbir tərəh etdisə axir,
Olub bir nəqs ol tərhində zahir.
Əlacından çəkib əl, oldu məyus,
Olub naçar Sabir qıldı əfsus.
Kəməndi-dərd ilə pabəstə Leyli,
Bəlayi-eşqdən dilxəstə Leyli,
Dilində dərdi-daği-firqəti-yar
Qalıb künci-nihandə zarü naçar
Küdurətxanə içrə oldu diltəng,
Dili xəstə, təni bitabü birəng.
Qəmi-həsrətdən ol mahi-duhəftə,
Edirdi nalə peyvəstə nohəftə.
O kim, Nakam, yarından cüdadır.
Dəvasız bir bəlayə mübtəladır.
Gərək ol vücudin tərk etsin,
Ki, getsin bəd əz an məqsudə yetsin.
Bulanlar zövqi-vəsli-aşinayi,
Vərayə tərk qılmışlar səvayi.

İBN SƏLAM SEYRİ-GÜLŞƏNDƏ LEYLİ
CƏMALINI MÜŞAHİDƏ EDİB
TƏMAŞAYİ-DİDAR QILDIĞI VƏ ARZUYİ-VÜSALİLƏ

## XASTKAR OLUB NEYLİ-MƏQSUDƏ ÜMİDVAR OLDUĞU

Köhəni-məşşateyi-rüxsari-məna
Edib məhbubeyi-mənayi-rəna.
Ərusi-dasitani qıldı tazə,
Çəkib rüxsarinə bu nöqazə –
Ki Leylayi-dilarayi-cəhansuz
O gün kim, olmuş idi aləməfruz.
Edib ol mahi-rövşən, seyri-gülşən
Cəmali-gülşəni etmişdi rövşən.
Rüxündə sünbüli-tər dəstə-dəstə
Xomi-zülfün dəmin dil paybəstə.
Cəmali aləmi-hüsnün bəhari
Bəhar hüsnünün aləm həzari.
Rüxi-tabani xurşidi-qiyamət,
Qiyamətdən qiyami bir əlamət.
Mükəhhəl gözlərində sürmeyi-naz,
Müqəvvəs əbruvani navəkəndaz.
Xəməndər xəm kəməndi-tabdari,
Kəməndi tabinin şiran şikari.
Xuraman ol qəzali-şirəfkən,
Edərkən əzm bağü seyri-gülşən.
Ərəbdən bir cəvani-növrəsidə
Həsəbdə, həm nəsəbdə bər güzidə.
Rəfiül-şövkətü sahibxəzanə,
Həmişə rayinə tabe zəmanə.
Səlami cümləyə məqsud əqsa,
Kəlamin eyləyirdi cümlə əsqa.
Qədər icra qılıb cümlə məramin,
Qəza İbn səlam etmişdi namin.
Həvəsnak idi peyvəstə şikarə.
Şikar əzmilə çıxmışdı kənarə.
Açıb pəri-tizpər şəhbazəsa,
Uçub cövlan edib səhra bə səhra
Nişimən eyləmişdi şaxi-sərvi
Ki, qılsın seyd bir rəna təzərvi.
Görüb Leylini nagah rəhgüzərdə,
Olub üftadəsi əvvəl nəzərdə.
Təzərv aqəbincə baz etmişdi pərvaz,
Şikar oldu təzərvə cövreyi-baz.

Əsir oldu görüb keysuyi-çinin,
Fəramuş eylədi dünyayü dinin.
Şikari tərk qıldı, etdi övdət,
Rəvan məavasinə qıldı əzimət.
Gəlib sərmənzilə çün irdi naçar
O mahin vəslinə oldu tələbkar.
Edib bu nüktəni yeksər fəramuş
Ki, mahi etməmiş bir kəs dərağuş.
Mühəyya eylədi bir nüktədani,
Ona verdi neçə gənci-rəvani.
Rəvanə eylədi Nəcdə həmana –
Ki, o mahin əqdini etsin təmənna.
Edib hişmətlə qət rah qasid
Olub mənzilgəhi-məqsudə varid.
Hüzuri-validi-Leylayə getdi,
Ədəblə dəstin əvvəl bus etdi.
Keçirdi töhfəsin bir-bir nəzərdən,
Neçə gənc idisə zərdən, gövhərdən.
Əzan pəs qıldı izhari-təmənna
Ki, ancaq mətləbidir əqdi-Leyla.
Edib məxdum Leyli bu sözü guş,
Rəvan qalxıb yerindən getdi xamuş.
Dəruni-xanədə açdı kamakan,
Nə mətləb var isə qıldı nümayan.
Bilib bu mətləbi həm ümmi-Leyla,
Nəhani qıldılar bir yerdə şura
Dedilər kim, bu mətləb dilnişindir,
Sərəncami səzaafərindir.
Vəli təxirinə bir neçə müddət,
Gərək labüd olunsun sərf hümmət –
Ki, Leyli xəsteyi-dərdi-nəhandır
Nəhani bir mərəzdən natəvandır.
Nə dəm kim, bu mərəzdən buldu səhhət,
Həman dəm etməyib bir ləhzə qəflət
Verib şükranələr xəndanü xürrəm,
Bu əqdi onda itmam eylərəiz həm.
Səadətlə olur bu əmri-dilxah
Bu həm çox dir çəkməz, inşaallah.
Taxıb tövqi-gövhər ol mahi-peykər
Olur asudə kanındə o gövhər.
Bulub məqsudini qasid həman dəm,

Təşəkkür eyləyib məsrur olub həm.
Gəlib verdi xəbər İbn Səlamə –
Ki. Mətləb xeyr ilə irdi xitamə.
Olan keyfiyyəti təqrir qıldı,
Hekayət eylədi təbşir qıldı.
Olub İbn Səlam ənduhdən azad.
Yüzi tazə, ləbi xəndan dili şad.
Nisar zər qılıb xərvar-xərvar,
Təsəddüq eylədi hər bar təkrar.
Qalıb pəs pərdeyi-möhnətdə Leyli,
Yanırdı atəşi-həsrətdə Leyli.
Nə agah idi təqdiri- qəzadən.
Nə vaqif bu mükəddər macəradən.
Pərişan keysuvani tək pərişan,
Dili pürdərd, çeşmi əşkəfşan.
Şəbanruz eyləyib Məcnunu yad,
Edirdi guşeyi-möhnətdə fəryad.
Biyabani-bəladə həm bədansan,
Qılırdı nalə Məcnuni-pərişan.
Təni məcruh, bağrı parə-parə,
Günü qarə, günündən bəxti qarə,
Dəmadəm yad edib Leylisi adin,
Yaxırdı nari-həsrətdə nəhadin.
Edərdi ixtira əbyati-dilsuz,
Olurdu şerxan Muyan şəban ruz.
Edənlər guş olub zar şəğəfnak,
Edirdi ta bədamən caməsin çak.
Edən aşiqləri, Nakam, bərbad
Fələkdir kim, edib əğyari dilşad
Həmişə təlx edər üşşaq kamin,
Verər aşiqlərə zəhrab camin.

NAZİMİN SAQİYİ-MƏNƏVİDƏN İSTİMDAD
QILDIĞI VƏ NƏŞEYİ-MEYİ-BİRƏNGDƏN
SƏRMƏST OLDUĞU

Gətir, saqi, şərabi-məğzcuşi
Ki, olsun fəth bu babi-xamuşi.
Bəni sərşar bir sağərlə şad et,
Təkəlləüm kişvərində Keyqubad et.
O meydən vermə kim, əqlə ziyandır.

O meydən ver kim, ol ruh rəvandır,
O meydən vermə kim, əsli xətadır,
O meydən ver kim, ol danişfəzadır.
Təəllül etmə kim, süstü zəbunəm,
Küdurətdən əliləm, bağrı xunəm.
Məni birəng edib rəngi-küdurət,
Tutubdur könlümü zəngi-küdurət.
Şərabi-biğəşi-canpərvər ilə,
Ləbaləb eyləyib bir sağər ilə
Kədərdən qəlbimi pak eylə, saf et,
Dilim əndişəsin müşkaf et.
Vəfa qıl etdiyin peymanə, saqi,
Gətir peymanəyi dövranə, saqi!
Bəşərte ki, qədəh ləbriz olsun,
Ələmfərsa, nişatəngiz olsun.
Necə bir sağər nuşin edib nuş,
Edəlim şahidi-zövqü dərağuş.
Məaşi-əqlin verib əqli-məadə,
Olub üftadeyi-təsiri-badə.
Yaxalım atəşə sudü ziyani,
Fəramuş edəlim hübbi-cəhani.
Ki, dünya düşməni-əhli-dilandır,
Anın əhdi-dilə sudi ziyandır.
Gətir, saqi, şərabi-ləlguni,
Kodur kum, gəştəkanın rəhnumuni.
Pəyapey mey verib tər qıl dəhanim,
Ki, olsun vəcdindən guya zəbanim.
Məbəyyən söyləyib Məcnun cəfasin,
Edim təfsir baqi macərasin.
Təali-əllah-zehi saqi ki, çalak,
Verib sağər məni qıldı şəqəfnak.
Əgər, Nakam, bicami-səbuyəm.
Vəli məsti-meyi-birəngü buyəm.
Sürahilə olub həmraz saqi,
Məni məşquf qıldı naz saqi.
Dilimdə cuş edir vəcdi-nihani,
Künun guş eylə məndən dastani.

### NOFƏLİN ŞİKARGAHDƏ MƏCNUNƏ DÜÇAR OLDUĞU VƏ İZHARİ-MƏHƏBBƏT EDİB MƏCNUNU VÜSALİ-YARƏ ÜMİDVAR QILDIĞI

Edib bu bəhsdə həlli-məsail,
Bu məzmun söyləmiş ustadi-kamil
Ki, sərgərdan olub səhradə Məcnun,
O dəm kim, hali olmuşdu digərgun.
Səriri-təxtdə bir radi-mümtaz,
Cülus etmişdi, olmuşdu sərəfraz.
Elm əfraz idi müli-ərəbdə,
Pəsəndidəydi ətvarü ədəbdə.
Delir bərgüzidə, adı Nofəl,
Nəsəbdə cümlədən əlavü əfzəl.
Yəli-şirəfkəni-meydani-rəzmin,
Çirağî-rövşəni eyvani-bəzmin.
Hünərməndü cəvanmərdü səxakar,
Rümuzati-məhəbbətdən xəbərdar.
Əyan etmişdi aləmdə şücaət,
Ona qılmışdı aləmlər itaət.
Rəha bulduqda şəstindən səhami.
Olurdu göydə biaram rami.
Götürsəydi nə dəm şəmşiri-bürran,
Verərdi şirlər şəmşirinə can.
Həmişə saz idi bəzmi-səfası
Həmişə baz idi babi-ətası.
Nə yerdə görsə miskinü naçar,
Ona min gunə mehr eylərdi izhar.
Pənahi-hümmətində namuradan,
Olurdu kamiranü şadü xəndan.
Məgər bir dəm o şahi-dadbəxşa,
Olub xahişkəri-seyrü tamaşa.
İradət eyləyib bir gün şikarə,
Əzimət eyləmişdi mürci-zarə.
Ta bir dəm tərəbpərdaz olsun,
Gəzib səhradə seydəndaz olsun.
Rikabında delirani-sərəfraz.
Götürmüşlərdi bazi-tizpərvaz.
Gəzirdi suyibasu mərğzari
Təcəssüs eyləyirdi kühisari.
Görüncə kuhdə bir cari-dilgir,
Edib ol ğardən ümidi nəxcir.
Olub çapuk həman suyə fürsran,
Gəlirkən kuhdə cövlanə hər an,
Baxıb bir güşadə Məcnuni gördü,

Həman aşüfteyi-dilxuni gördü.
Ki, xak üzrə düşübdür zarü nalan,
Zəbanü bidibi bitarü heyran.
Qədi bari-təəşşüqdən xəmidə,
Gəriban şəkibasi dəridə.
Gəhi giryan olur, gəhi qəzəlxan,
Olur guş eyləyən mədhuşü heyran.
Təəccüb eyləyib Nofəl bu halə,
Açıb ləb ibtidar etdi sualə.
Dedi: «Kimdir bu üftadə, bu müztər,
Neçün böylə olubdur xakbərsər»?
O cəmiyyətdə bir mərdi-süxəndan
Bilirmiş hali-Məcnuni kəmakan.
Edib ol binəvanın vəsfi-halin,
Qılıb təqrir asari-məalin.
Dedi: «Bu bir əsiri-binəvadır,
Bəlayi-dərdi-eşqə mübtəladır.
Olub dildadəsi bir nazəninin,
Fədai-eşq edib dünyayü dinin.
Qəmi-hicrandən düşmüş bu halə,
İrişməz dəsti-ümidi vüsalə.
Vüsali yardən məhrum olubdur,
Buna bir mehriban mədum olubdur.
Diyari-Nəcddədir yari-diyari,
Şəhi-xuban Leylidir nidari.
Vəzan olsa səbəbkar ol tərəfdən,
Səbayə söyləyir əşari-rövşən.
O canibdən olursə əbr peyda,
Həman əbrə qəsaid eylər inşa.
Nə abu nandır şürbi-cəzasi,
Nə nəngü namidəndir iddiasi.
Həmişə tuşeyi-zadü nəvali,
Həvayi-Leylidir, Leyli-xəyali.
Bilənlər eşqdə həddi-kəmalin,
Edənlər fəhm əbyati-məalin,
Gəlirlər çarsudən dəstə-dəstə,
Hüzurində olurlar dəsti-bəstə.
Edirlər badədən ləbriz cami,
Qoyurlar pişgahindən təami
Ki, şayəd nuş edib bir cam nuşin,
Bula ol camdən filcümlə təmkin.

Həzaran cəhdü iqdam ilə axər,
Həzaran səyü ibram ilə axər.
Fəqət bir cam edər nuş ol hünərmənd
O da ba yadi-Leylayi-şəkkərxənd.
Bu növ ilə keçir leylü nəhari,
Budur peyvəstə eşq ilə mədari».
Bu halətdən olub Nofəl xəbərdar,
Dedi: «İmdi mənə fərz oldu naçar –
Ki, bakam eyləyib bu namuradı
Edim dilşad bu möhnət nəhadı.
Gəzirdim bən şikar üçün həmara,
Düçar oldum əcəb türfə şikara».
Peyda oldu rəxşindən həman dəm,
Gəlib Məcnuni-zarə oldu həmdəm.
Nəvazişlər edib Məcnunə təkrar,
Ona mehri-dərunin qıldı izhar.
Cəlus etdi onunlabir səmatə,
Süluk etdi təriqi-ixtilatə
Baxıb Məcnuni-zarü biqərarə,
Verib rövnəq kəlami-abdarə
Nə söylərdisə Leylidi məali,
Hədisindən deyildi Leyli xali.
Bu güftar ilə Məcnun rəmidə
Bulub aram, oldu aramidə.
Bədihi şerlər inşad qıldı,
Süruri Nofəli dilşad qıldı.
Hərifin xoş bulub, olmuşdu xoşdil,
Deyildi rəsmi-göftarındə qafil
Ona irad olan hər bir xitabın,
Verirdi bir qəzəl birlə cəvabın.
Bu növilə bulub aram bir dəm,
Olub Nofəl ilə həmcam bir dəm.
Təam əkl eylədi, nuş etdi badə,
Dəruni-dərdini qıldı ifadə.
Kəlami çərblə xoşruy Nofəl,
Edib avazə şirinkuy Nofəl.
Dedi kim, agəh ol, ey aşiqi-zar!
Fəraqi-yardən olma diləfkar –
Ki, Leyli mürc olub gər etsə təyaran,
Şərər tək səngdə gər olsa pünhan,
Həvadə seyd edib şəhbaz həngim,

Çıxardıb səngdən füladi çəngim,
Sənə yar eylərəm ol nazənini,
Sənə ram eylərəm ol məhi-çəbini.
Edincə guş Məcnun bu Nəvidi,
Təravətyab olub nəxli-ümidi,
Həzaran şükr edib təzim qıldı,
Sənalar söylədi, təkərrim qıldı.
Dedi: «Ey davəri-fərxundəsiyrət,
Təhəmtən qüdrətü Bəhramqeyrət.
Sənin rəyində yox təğyir, əmma.
Mənim bəxtimdə yoxdur bu təqaza–
Ki, ol məhvəş bənimlə yar olsun,
O gülçöhrə bənə dildar olsun.
Verirlərmi gülü gülşəndə badə,
Verirlərmi o huri divzadə?
Bənəm aludədamanü siyəhkar
Bənim bu damənim təkrar – təkrar –
Olubdur şüstü şupak olmamışdır,
Nəzafət andə idrak olmamışdır.
Budur vəhmim bənim iqbali-dunim,
Ziyasız əxtərim, bəxti-zəbunim.
Müsaid olmayıb sən daxi naçar,
Qoyursan nimeyi-rəhdə bəni xar.
Budur oulü bənə tərk et bəni sən,
Ki, kəndi karimə məşğul olum bən.
Nə sən vəqti-əzizin eylə zaye
Nə olsun dəhrdə bu ar şaye.
Görüb Məcnundə Nofə bu cuşi,
Bu suzü cangüdazi, bu xüruşi.
Mükəddər oldu, bağrı döndü qanə,
Dilində nari-qəm çəkdi zəbanə.
Qılıb peymaninə sugəndi-peyvənd,
Təəhhüd eylədi, yad etdi sugənd.
Edib təkrar əhdi üzrə əfzun,
Dedi: «Ey aşiqi-fərzanə Məcnun!
Açıb cəngi, çəkib şəmşiri-bürran,
Edib guşəş bəsani-şiri-qürran,
Əgər zərlə olur isə zər ilə,
Və gər zor ilə olsə xəncər ilə,
Həman Leylayi-məhruyi-səmənbər,
Səninlə olmayınca yarü həmsər,

Bəsati-eyşdə bir cam tutmam,
Şəkibəyab olub aram tutmam.
Vəli səndən ricadarəm ki, sən də
Süluk etmə təriqi-napəsəndə.
Cünuni tərk qıl, fərzanəvar ol!
Müsafi eşqdə mərdanəvar ol!
Bu vəhşət tərkinə ahəng səndən,
Bu yolda tiğ bəndən, cəng bəndən.
Təzira oldu bu peymani Məcnun,
Keçib aşüftəlikdən, oldu məmnun.
Cünunluq qeydü bəndindən güşadə
Şəkiba qeydinə gərdən nəhadə.
Təriqi-əhdində sabit, vəfadar,
Dili-asudə birlə axər kar.
Qılıb darül-iqrarin, həm pənahın,
Girami Nofəlin aramgahin.
Olub Nofəllə həmpeymanü həmdəm,
O şahin sayəsində oldu xürrəm.
Gedib gərmabdə buldu təravət,
Geyindi faxiranə tazə xələt.
Kədərdən qaib olmuş hüsnü rüxsar,
Cəmalindən pədid oldu digər bar.
Ləbi innabi, rəngi ərğəvani,
Qəddi sərvi-çəmənzari-cəvani,
Mücəəd kisuvani ənbəramiz,
Sərapa cümlə əndami dilaviz.
Qərəz Məcnun-məşhuri-cəhanin
Olub ən aqili əhli-zəmanin.
Dəmi-göftardə nitqü bəyani,
Edərdi kəşf əsrari-nəhani.
Olub adabinə məftun Nofəl,
Edirdi izzətin əfzun Nofəl.
Nə Məcnunsuz tərəbpərdaz olurdu,
Nə bəzmi-eyşi bir dəm saz olurdu.
Bu növilə iki-üç mah yekca
Bərabər tutdular cami-müsəffa.
Fələk üşşaqə mehr eylərsə, Nakam!
Edər təzvirinə ol mehrini dam.
Fəribi danəsin eylər pədidar,
Həmin təqrib ilə üşşaqi hər bar.
Qılır axər əsiri-dami-təzvir,

Qoyur çahi-məzəllətdə sərazir.

### NOFƏLİN LƏŞKƏR İLƏ QƏBİLEYİ-LEYLAYƏ GETDİYİ VƏ LEYLİNİ XASTKAR OLDUĞU VƏ ƏQLİ-LEYLİDƏN NAÜMİD OLUB TƏRƏFDARANİ-LEYLİ İLƏ KARZAR QILDIĞI

Sipəhsalari meydani-məani
Çəkibdir bu rəviş qeyş bəyani
Ki, bir gün Nofəlü Məcnun bahəm.
Tərəbi-bəzmində dəmsaz idi xürrəm.
Tərənnüm eylədi məcnun nagah,
Edib bir ahi atəşnaki-cankah.
Qılıb irad şeri-aşiqanə,
Şikayət eylər oldu arifanə –
Ki, ey ümidbəxşü süstpeyman,
Budurmu rəsmi-əhdi-namdaran?
Bana peyman verib, qıldın bəni şad,
Künun etməzsən ol peymani dər yad.
O əhdin kim, deyil sidqi nümayan,
Deyildir sən kimi zişanə şayan,
Sənə bavər edib oldum şəkiba,
Müdara eylədim eşq ilə hala.
Xəbərdar ol ki, bitabü fəraqəm,
Pərişani-bəlayi-iştiyaqəm.
Edər olsan əgər hümmət vüsalə,
Zəhi hümmətü illa lamahalə!
Bəni aləmdə napeyda görürsən,
Görürsənsə yenə şeyda görürsən.
Əgər olmazsə Leyla yari-məcnun,
Cəhandan məhv olur asari-Məcnun.
Edincə guş Nofəl bu xitabi,
Bu nuşiamizü nişavizi-itabi
Dərunində bulub hiddəti-həmiyyət,
Yüzində zahir oldu xuni-qeyrət.
Götürdü nizə, oldu qərqi ahən,
Həmayil etdi tiğin, geydi cuşən.
Güzidə qıldı yüz mərdi-dilavər
Ki, hər fərdi idi yüz mərdə bərabər.
Rəvan oldu bəsani-şiri-qürran,
Dilində kin, əlində tiği-bürran.

İrişdi Nəcddə bir mərğizarə,
Nəzul oldu çəməndə bir kənarə
Quruldu xeymə, buldu bir dəm aram,
Rəvan bir qasid ilə verdi peyğam
Ki, bən xunxar bir ləşkərdə hala,
İqamət etminəm bunda mühəyya.
Qılıb arəstə Leylini filhad,
Edin bu canibə ol mahi irsal.
Nəvazişlər qılıb bən həm o sərvi,
O afətkari, ol rəna təzərvi,
Edim aşüftəsi məcmmnun ilə yar
Ki, Məcnundur ona yari-səzavar.
Cigərtəşnə içib abi-həyati,
Bulursə ətəşi-mühlikdən nicati.
İrir, əlbəttə, həqdən əcri-saqi,
Bulur saqi dəxi bir nami-baqi.
Əgər simü zərə mövqüf isə kar,
Rəvanə eylədim xərvar-xərvar.
Vəgər xoşluqlə olmazsa müyəssər,
Səri tədbirdir tiğə müqərrər.
Bu peyğami ki, qasid qıldı icra
Xuruşan oldu xuşavəndi-Leyla.
Dedilər: «Leylidir bir dürri-məknun,
Dürri-məknun deyil şayani-Məcnun.
Cəmali-Leylidir bir mah əkməl,
İrişməz mahə dəsti-əzəmi-Nofəl.
Təriqi-namdə namuskaruz,
Rahi-namusda həm cansinaruz.
Əgər Nofəl olursə cəngcuyan,
Bu şəmşir iştə, bu gəncər, bu meydan.
Mütiiz mərdomi-nikuşüarə,
Əduyi-cəngcuyiz kinədarə.
Çü qasid guş qıldı bu kəlami,
Gətirtdi Nofələ verdi pəyami.
Qəzəbnak oldu Nofəli-əjdərasa,
Götürdü nizəsin şiri-nərasa.
Olub gəngəvaran yeksər səvara,
Mühəyya oldu hər kəs karzara.
Verib Nəcd əhli dəxi rəng cəndə,
Çəkib səf qıldılar ahəng cəngə.
Duhul fəryad edib gəldi fəğanə,

Qərivi-sərkəşan doldu cəhanə.
İrişdi çərxə fəryadi-təbirə,
Fələkdə çeşmi əncüm oldu xirə.
Çəkib şəmşir kin hər iki ləşkər,
İki canibdən oldu həmləavər
Bulub həngameyi avərd tüğyan,
Töküldü xakə xuni-rəzmcuyan.
Rəvan oldu səri-şəmşirdən xun,
Müsaf oldu besani-rudi-Ceyhun.
Həvani nizələr qıldı neyistan,
Zəmini xuni-sərbazan meyistan.
Bu darü girdə, bu təngnadə,
Bu cəng içrə bu meydani-bəladə.
Edərkən cəng hər bir şiri-pürdil
Ki, etsin mətləbi-Məcnuna hasil.
Vəli Məcnun edib bir qeyri-ahəng
Olub Leyli sipahi birlə yekrəng.
Edirdi sərnigun kəndi pənahin,
Qılırdı bisükun kəndi sipahin.
Sipahi Nofəlin olduqda çirə.
Olub giryan, baxırdı xirə-xirə.
Tərəfdarani-Leyli olsa Mənsur,
Qılıb xəndə, olurdu şadü məşkur.
Güruhi-Leyliyə təhsin edirdi,
Sitahi-Nofələ nifrin edirdi.
Qılıb dərgəhi-həqqə ərzü hacət,
Sipahi-Nofələ nifrin edirdi.
Görüb bu haləti bir mərdi-dana,
Dedi Məcnunə kim, ey yavəpeyma!
Səninçün etmişüz biz tərki-dahət,
Çəkirsən sən bizə tiği-ədavət.
Sənin işkalini etmək üçün həll
Edir bu cəngi bu aşubi Nofəl.
Bu ləşkər səndən üçün geymiş ahən,
Təşəkkür etməyib əvanına sən
Neçün xunxarına qəmxar olursan,
Sənə qəmxardən bizar olursan?
Qılırsan ceyş ədayi-müzəffər,
Çəkirsən dustan qətlinə xəncər.
Eşitdi çünki Məcnun bu xitabi,
Bu tən nagüvarı, bu itabi

Güşad etdi dəhanın eylədi cuş,
Dedi: «Ey eşqdən bibəhrə, xamuş!
Rizayi-yar üçün aşiq verir can,
Edir canü tənin cananə qurban.
Bu peykar içrədir çün xəsm yarım,
Bənim tiğ ilə, tir ilə nə karım!
Dilim yar ilədir məşğul hər an,
Nə yerdə dil olursa, ondadır can.
Rəvadırmı görən, olurmu layiq
Ki, məşuq ilə etsin cəng aşiq?
Əgər istər olursa canı canan,
Yolunda eylərəm mən filhal qurban.
Firuzan eyləyib nari-cəfanı,
Qılıb nabud asari-vəfanı,
Vəsilə bən olub bu karzarə,
Diriğa, olmuşam əğyar yarə.
Künun bu kəşməkeşdən, bu cəfadənə,
Bu kirudardən, bu macəradən,
Hüzuri yardə bən rusiyahəm,
Əsiyəm, cürmkarəm, üzrxahəm.
Bu güftari ki, sail eylədi guş
Nəbərd əhvalını qıldı fəramuş.
Verib insaf təsdiq etdi, getdi,
Gedib həm Nofəli agah etdi.
O dəm kim, gərm olub həngameyi-cəng,
Olub şəmşirlər qan ilə həmrəng,
Sinani-cansitanlə pəhləvanam
Edirdi səfheyi-meydani-rəyyan.
Edirdi nə suyə həmlə Nofəl,
Açırdı andə bir xununi-cədəl.
Kimə şəmşir ilə etsəydi çarə,
Edirdi mərdi mərkəblə düparə.
Gəhi tir ilə, gahi gürzi giranlə
Gəhi şəmşir ilə, gahi sinalən
Olurdu səhni-meydanə sərəfşan,
Edirdi cəngcuyani pərişan.
Qərəz cəngavarani-tizi-nizə,
Edib ta şam aşub sətizə.
Qürub etdikdə Mehri-aləmara,
Bulub aramləşkəri cayi-bərca.
Xurü xabə olub hər kəs tələbkar,

Hər iki ləşkər etdi tərki-peykar.
Ləvayi-sübh çün oldu nümayan,
Mühəyya oldu cəngə cəngcuyan.
Baxıb ətrafə nagah gördü Nofəl
Ki, izzət zillətə olmuş mübəddəl.
Tərəfdarani-Leyli fövc ba fövc,
Bəsani-bəhri-bipayan urub mövc –
Gəlirlər ərseyi-cəngə şitaban,
Pəyapey kinəcuyanü qərivan.
Görüb bu kəsrəti qıldı təəmmül
Ki, sülh olmazsa müşküldür təhəmmül
Edərsə cəng məğlub naçar.
Qalır bədnam aləmdə olur xar.
Güşad etdi həman dəmdə babi-sülhü,
Müraat eylədi adabi sülhü.
Miyancılər bulub qıldı rəvanə,
Rəvan oldu miyançilər miyanə.
Edib sərləşkərə pəndü nəvaziş,
Miyanə verdilər sülh ilə saziş.
Olüb hər iki canib sülhə mail,
Müvadat t ilə həll oldu təsail
Budur, Nakam, dövrani Sipehrin,
Kəsib üşşaqdən asari-mehrin
Edərsə aşiq hər kəs inayət,
Anı eylər Ləgədkubi-əhanət.

NOFƏLİN DİGƏR BİR QƏBİLEYİ-LEYLİ İLƏ
CƏNG EDİB ZƏFƏR BULDUĞU VƏ
FƏRİFTEYİ-TƏZVİR OLUB TƏRKİ-VƏFA DAMANİ MƏTLUBİ
CƏNGDƏN RƏHA QILIB PEYMANŞİKƏN OLDUĞU

Edənlər ərseyi-mənadə cövlan,
Həmin tərz ilə olmuşlar forfan –
Ki, Nofəl çünki sülhə oldu məcbur,
Dilində nari-kinə qıldı məstur.
Dönüb avərdgəhdən bisərəncam,
İrişdi mənzilində buldu aram.
Gəlib Məcnun edib fəryadə acaz,
Dedi: «Ey pəhləvani rayyətəfraz.
Sənin peymanına təhsin ki, axır,
Vəfadən etmədin bir rəng zahir.

Budurmu mərdlikdə siyati-namin,
Budurmu əhdi-süstü natamamin?
Budurmu hümməti şəmşiri tizin,
Budurmu qayəti cəngi sitizmin,
Götürdük gah tici, gah sinani,
Bənimlə düşmən etdin dustani.
Bənə ancaq bu oldu səndən
Ki, oldu aşina biganə bəndən».
Kəlamin xətm edib nalan-nalan.
Töküb xunabə Məcnun oldu giryan.
Olub bu töhmətin dilxuni Nofəl,
Müxatib eylədi Məcnuni Nofəl.
Dedi: «Ey aşiqi-zarü balakəş,
Həmin həngamədən olma müşəvvəş
Ki, aidə olmadığım bi yarü ənsar,
Bəni vadar qıldı sülhə naçar.
Künun tərtib edib bir tazə ləşkər,
Gərəkdir eyləyim cəng mükər.
Edib bir Rüstəmanə karzari.
Əzalə eyləyim bəndən bu kari».
Həman dəm hökm qıldı, verdi fərman,
Rəvanə eylədi peyk şitaban.
Çəhar ətrafdən cəm oldu ləşkər,
Təmami şircəngali-dilavər.
Bulub samar sipahi biqərani,
Sipahi-şöhrəti tutdu cəhani.
Həman avərdgahə qıldı ahəng –
Ki, aidə eyləmişdi cəngi-birəng.
Sərapa dəşti-Nəcdi tutdu ləşkər,
Xəbərdar oldu Nəcd əhli sərasər.
Ki, kuhi-dəşti qılmış Gülüstan san,
Xəyam laləgun rayat əlvan.
Qılıb nəzarə salari qəbilə
Görüncə bu şükuhi etdi veylə.
Fərarə bulmayıb bir rahi-çarə,
Zəruri çəkdilər səf karzarə.
Çəkib hər iki ləşkər xəncəri-kin.
Müsafi qıldılar xun ilə rəngin.
Olub cəngəvaran yeksər xuruşan,
Cəhan dərya misali oldu cuşan.
Qılıb gərd suvaran çəri-pürmiği,

Dühul rəd oldu bərq şöləvər tiği.
Təgərgi xəncərü barani peykan.
O barişdən olurdu mərg rizan.
Sipəhsalar Nofəl tiği-dərdəst,
Çəkib nərə bəsani-şir sərməst.
Edirdi zəxmi qərqi-xun yəlani,
Qılırdı tiği bəhri-xun cəhani.
Ələmdari edib xak ilə yeksan,
Sipahin qəlbini qıldı pərişan.
Sipahi Nofəlin oldu müzəffər,
Həzimət buldu Nəcd əhli sərasər.
Bürəhnəsər olub ətfalü piran,
Əmanə gəldilər etdilər əfgan.
Ki, ey şahi-cəvanbəxti-cəhandır!
Bağışla cürmimiz, olma cəfakar
Cigərxəstə, süpərəfkəndəqaniz,
Sipəhsalara müxlis, bəndəqaniz.
Sipəhəfkəndələrlə eyləmək cəng,
Degil şayəstə ərbabi-orəng.
Çü Nofəl gördü bu ahü ənini,
Edib əfv onları, tərk etdi kini.
Dedi kim, Nəcddən məqsudum əsla,
Degildir gövhəri gəncü hədaya.
Bəni məqsudiniz etməksə xoşhal,
Bənə filhal edin Leylini irsal.
Gəlib Leyli atası zarü giryan,
Yüzün xak üzrə qoydu, oldu nalan.
Dedi: «Ey padşahi-bəndəpərvər,
Səninlə fər bulmuş təxti əfsər
Bənəm bir pirü dilşikəstə,
Xədəngi-dərddən məcruhü xəstə.
Bu halətdən məluləm, şərmsarəm,
Xəcalətdən həmin simabvarəm.
Bənim şikvəm degildir əxtərimdən,
Səna yetməndən, ancaq düxtərimdən.
Əgər ehzar edib ol məhliqani,
Kəminə bəndənə bəxş etsən ani,
Əgər yaxsan besan oudi narə,
Və gər tiğ ilə etsən parə-parə,
Sənaxanın olub hər ləhzə candən
Mütiyəm əmrinə xoşnudəm aidən.

Vəli Məcnunə anı yar etməm,
Bu nəngi kəndimə həmvar etməm.
Ki, odur bir vəhşiyi-hümayunpeyma,
Necə vəhşiylə bulsun üns Leyla?.
Kərəm eylə, bəni bədnam qılma,
Təbəhkar etmə, bədfərcam qılma.
Əgər fəryadimə sən yetməz isən,
Qəsəm olsun xudayə kim, gedib bən –
Edib o məhliqani sərbəridə.
Qılıb xəncərlə əndamin dəridə,
Nəhadə eylərəm pişi-kəlabə,
Əgər müstəcib olsam da əzabə.
Ümidim qət edib ol mahvəşdən,
Rəha bulsam bu kəşməkəşdən,
Gərəkdir löqmeyi-səg olsun ol məh,
Oluncə həmsəri-Məcnuni-gumrəh!»
Bu güftari kim, etdi guş Nofəl.
Təəmmül eylədi əncamin əvvəl.
Müvafiq olmayıb təqdirə tədbir,
Həman tədbiri bərhəm qıldı təqrir.
Edib dəryad Məcnunun ədasin,
Keçən cəng içrə vaqe macərasin.
Dedi: «Ey pir, artıq eyləmə qəm,
Sənə mövqufdur bu əmr mübhəm,
Əgərçi Leylini bən xast karəm
Vəli xoşluqla versən xast karəm
Bu əmrə çünki sən xoşdil degilsən,
Onu almaz sitəmlə kimsə səndən.
Bu mətlə olmasa xoşluqla hasil,
Cəfadən olmazam bən daxi xoşdil.
Bənim qəsdim bu qovğadən rizadır.
Nə dilazarlıqdır, nə cəfadır.
Bu məzmun eyləyib təqrir Nofəl,
Verib peymaninə təğyir Nofəl.
Götürdü ləşkərin oldu rəvanə,
Cahandə qoydu baqi bir fəsanə.
Bu halətdən olub agah Məcnun.
Axıtdı gözlərindən əşki-gülgün.
Gəriban çakü təni bitabü xəstə.
Zəbani şikvəgu xatir şikəstə.
İtabi töhmətə ağaz etdi

Açıb ləb, Nofələ avaz etdi.
Neçün qıldın bənə zülmü mükərrər,
Neçün etdin bəni böylə mükəddər
Ləbim təşnə, dilim suzan buldun,
Atəşdən bağrımı büryan buldun.
Bəni ümidvar etdin götürdün,
Kənari-çeşmeyi-Xizrə yetirdin.
Zülali-arzumi nuş edən dəm,
Dərunim suzişin xamuş edən dəm.
Əlimdən sağəri-ümidim aldın,
Cigərtəşnə genə səhrayə saldın.
Bu imiş rəngi əhdi etibarın,
Bu imiş həngi-dəsti-iqtidarın.
Səninlə etməyəydim kaş ülfət,
Bənə ta yetməyəydi bu nədamət.
Bəni etdinsə də sən boylə diltəng,
Sənə də həm yetər bu nəngi bədrəng.
Bəni qoydunsa da sən boylə həsrət,
Sənə də həşrədək bəsdir bu töhmət.
Bu təni, bu itabi söyləyib faş,
İnantab oldu çeşmin qıldı xuntaş.
Miyani cəmdən çıxdı kənarə
Mücərrəd oldu, getdi kuhsarə.
Budur, Nakam, dövranın vəfas,
Budur aşiqlər ilə macərası.
Əgər bir ləhzə aşiq olsa dilşad,
Olur çərxin həsəddən səqfi bərbad.

## MƏCNUNUN ZƏNCİRİ-AHƏNƏ GİRİFTAR OLDUĞU VƏ BU BƏHANƏ İLƏ KƏŞTİ-GÜZAR EDİB TƏMAŞAYİ-DİDARİ-YAR QILDIĞI

Genə, çün oldu səhragərd Məcnun.
Təzaid qıldı gün-gün dərd Məcnun.
Olub atəşfişan ahi mükərrər,
Şəkibi xərmənin yaxmışdı yeksər.
Bulub şiddət dəmadəm iştiyaqi,
Çəkirdi bari-dərdi-iftiraqi.
Qərarü səbrdən, aramdən dur,
Dili baqəm, qəddi xəm, cismi rəncur.
Gəzirdi sübhlər taşam nalan,

Edirdi şamlər tasübh əfqan.
Məgər bir gün Nəsimi-kuyi-Leyli,
Həvayi-muyi-ənbər buyi-Leyli,
Məşami-arzusin qıldı məşhun
Rəvan oldu diyari-yarə Məcnun.
Çıxıb yoldan kənarə iztirari,
Nəşimən eyləmişdi bir kənari.
Bəhancuyi idi kim, necə etsin,
Nə rəng ilə hərimi-yarə getsin.
İrişdi nabiyusan ol məkanə,
Xəmidə bir acuzi-pürfüsanə.
Dedi: Ey süst əhdü çərbqüftar,
Nə üçün etdin bəni zarü diləfkar?
Nə üçün peymanını fərmuş etdin,
Edib böylə bəni, dərçuş etdin?
Çəkib zəncirə bir divan əvari,
Müqəyyəd eyləmişdi ol fikari.
Görüb bu haləti Məcnun xəstə,
Dedi: «Ey maməkim kimdir bu bəstə?
Nə çün pabəndi-zənciri-bəladır,
Nədir cürmi, nə dərdə mübtəladır?».
Əcuzə şərh qıldı kim, həqiqət,
Degildir bu səzavari-üiubətq.
Vəli hər ikimiz biz təngdəstiz,
Qeyudü möhnət ilə paybəstiz.
Məaş üçün olub neyrəngpərdaz.
Həmin neyrəngi axər etmişiz saz.
Bu hal ilə dolaşıb kuyi-baku,
Nə hasil eyləriksə muyi-bamu
Olub yeksan iki səriə məqsəm,
Olur nisfi anın, nisfi bənim həm.
Bilib bu sirri Məcnuni-pərişan,
Əcuzun damənin bus etdi nalan.
Dedi: «Məcnuni-dövranəm həmin bən,
Bənə şayəstədir bu bəndi-ahən.
Bu mərdi-bidili azad eylə!
İnayət qıl, bəni dilşad eylə!
Həman zəncirə çək bən biqərari,
Dolandır guya-ba-ku hər diyari.
Nə hasil olsa qeyrə etmə qismət,
Sənin olsun təmami bişərakət.

Acuzə bu ticarətdən olub şad,
Olub əndişeyi-şirkətdən azad.
Ol ki, bəstənin zəncirin aldı,
Götürdü gərdəni-Məcnunə saldı.
Görüb zənciri Məcnun gərdənində
Rəgi vəcd eylədi cünbuş tənində.
Xəmi-zəncir ilə dəmsaz oldu.
Tənini birlə həmavaz oldu.
Dedi: «Ey zülfi-xuban tək dilara,
Əsiri-həlqən olmuş əhli-sövda!
Sənin var minnətin boynumda hər bar –
Ki, sənsən yadigari-türreyi-yar!
Rəha qıldın bəni qeydi-ədəbdən,
Əcəb sərriştəsən aşiqlərə sən.
Bənəm rahi-bəladə üftadə ,
Şkənci-sərvinə gərdən nəhadə.
Cünunluq zivərindən ur idim bən,
Əcəb pirayəbəxş oldun bənə sən.
Dəmi-möhnətdə həmrazim olursan,
Fəğan etsəm, həmavazim olursan
Bənim tiri-qəmə cismim nişandır.
Anınçündür ki, sinəm şan-şandır.
Sənin sinən neçün qərbalsandır?
Kimin peykaninə cismin nişandır?
Məni bir məhliqa, bir sim sima,
Edibdir didə bərrəh həlqəasa.
Sənin həlqən kimindir çeşmidari,
Ki, açmış rahə çeşmi-intizari?.
Bənim tək sən dəxi Məcnun degilsən,
Nəçün sən boylə tövqü qəm begərdən?
Verib təbdil güftarə dübarə,
Təvəccöh eyləyib kuyi-nigarə
Dedi: «Zəncir ilə oldum həmavaz,
Həvayi-zülfün ilə, ey füsunsaz!.
Gəl, ey keysuləri zənciri-sövda
Ki, zəncir içrə oldum dərd fərsa.
Qəmi-hicran, geysuyi-girəhgir,
Bəni etmiş əsiri-dami-zəncir.
Bəni zəncirdə qoyma pərişan,
Götür zəncirimi, ey şahi-xuban!
Ki, künci-xaneyi-qəmdir məkanim,

Səlasüldür ənisim, həmzəbanim».
Tutub zəncirdən axər Əcuzə,
Dedi Məcnuni-zarü tirərizə.
Ki, vəqti-kardır, durma, rəvan ol!
Bənimlə yekdil ol, həmdastan ol!
Olub tabe Əcizə ol yeganə.
Rəhi-Nəcdi tutub oldu rəvanə.
İrib Nəcdə Əcuzi-rəngi-pərdaz,
Qılıb həngameyi-baziçəsin saz.
Çəkib Məcnuni hər dəm bir məkanə,
Dolandırdı anı xanəbəxanə.
Edənlər seyr, olub məftunü heyran,
Kimi xəndan olurdu, kimi giryan.
Gəzib hər xeymənin səhdə Məcnunini
Edirdi nalələr məhzunü məhzun.
O kim, dana idi, giryan olurdu,
O kim, nadan idi, xəndan olurdu.
Bədihi şerlər icad edirdi,
Həman «Leyli!» deyib fəryad edirdi.
Ururdu lətmə ətfali-qəbilə
Edib ol lətməyi Məcnun vəsilə –
Gəhi məhzuz olub xəndan olurdu,
Gəhi dərcuş olub nalan olurdu.
İrişdi xeymeyi-Leylayə axir,
Təni-zarində oldu rəşə zahir
Deyib «Ya dust» çəkdi nəreyi-hu,
Anı guş etdi Leylayi-məlekru.
Gözündən damən ilə əşk saçdı,
Həman dəm xeyməsi damənin açdı.
Edib Məcnununi mehman didar.
Niqabın açdı, qıldı ərz rüxsar.
Görüb rüxsarını Məcnun o mahın,
Edib əğyardən pünhan nigahın.
Düşüb torpağə rumal xakə.
Xitab etdi o mahi-tabi nakə –
Ki, ey xəndani-güli-gülzar hüsnün
Məni qıldı həzari zar-zar hüsnün.
Əminəm bən sənin eşqində hər bar,
Vəli sən daima xariləsən yar.
Qəmi-eşqinlə dilgərm olmayanlar,
Olurlar dərgəhində nazpərvər.

Vəli eşqində pamali-qəməm bən,
Hərimində, gənə naməhrəməm bən.
Məazallah! Bu əsnadım xətadır.
Ki, bidadın sənin eyni-vəfadır.
Bənəm adabi-eşqində xətakar,
Nə cövr etsən səzavarəm, səzavar!
Əgərçi eylədim eşqində təqsir,
Vəli gəldim künun boynumda zəncir!
Qəribəm, bikəsəm, bidəstigirəm,
Səngi-zənciri-eşqinlə əsirəm!
Künun babindəyəm zənciri-dərça,
Nə hökm eylərsənsə, eylə icra.
Əgər olsa, mələklər üzrxahim,
Degildir qabil puziş günahim.
Başim tiğinlə cismimdən cida qıl,
Bəni hicran bəlasından rəha qıl.
Səri-tiğinlə gər olsam sərəfraz,
Sərəfrazani-dəhrə eylərəm naz!
Rəhi-eşqində gərçi gümrəh oldum,
Cəzami duzəxi-hicrində buldum.
Rəva görmə ki, zindani ələmdə
Qalım bir daxi zənciri-sitəmdə.
Edib tüğyan dəmadəm suzişi-eşq,
Bulub şiddət dilində cuşişi-eşq
Qəbasin çak edib muyan-muyan,
Çəkib nalə, edib bəzmi pərişan,
Rəvan zəncirin etdi parə-parə,
Rəvanə oldu, getdi guhsarə.
Həzaran ah kim, dilbəstəganın,
Degil rəyincə dövrani zəmanın.
Ki, dilbəstə olan dilşad olmaz,
Qeyudi-dərddən azad olmaz.
Xoşa, Nakam, o kim azadədildir,
Nəziri-bağdır, nə pa begildir!

BİR MƏHLİQA MƏCNUNİ BƏNDİ-ZƏNCİRDƏ
GÖRÜB ETİRAZ ETDİGİ VƏ CƏVABİ-TÖHMƏTAMİZ GUŞ QILIB
ŞƏRMSAR GETDİGİ

Olub məcnunə zibəfza səlasil
Cünuni-zənciri boynundə həmail

Dilində həsrəti-keysuyi-Leyli,
Məşamində həvayi-buyi-Leyli.
Gəzərkən kubaku nalani-muyan,
Gəhi bazikunan, gahi qəzəlxan –
Görüb Məcnuni nagah bir pəriru,
Dedi: «Ey aşiqi-valeh, nədir bu?
Nə üçün zəncir dərgərdən olubsan,
Nə üçün dildadeyi-ahən olubsan?
Nəçün belə olub divanə kirdar,
Bu zəncir içrə olmuşsan giriftar?
Olu Leyli sənə bir ləhzə həmdəm,
Səni kim, suləməz vəslilə xürrəm,
Fəramuş et anı, qılma daxi yad,
Bəlayi-firqətində etmə fəryad!
Bənim bu pəndimi gər eyləyib guş,
Edib bu atəşi-cansuzi xamuş.
Bənə aşiq olub, məftunim olsan,
Bənə məftun olub Məcnunim olsan,
Olardım bən sənə yari-vəfadar.
Səni hicranə etməzdim giriftar.
Eşitdi bu sözü Məcnuni-nalan,
Edib əfğan, dedi: «Ey mahi-taban!
Ki, sən gər huriyi-müşkinmusən,
Gül bağı cinansən, tazə rusən.
Vəli Leyli degilsən, neyləyim bən
Ki, məhbubi-pəsəndidə degilsən!
Əgər məftunü dildadə bən isəm,
Əgər Məcnuni-üftadə bən isəm,
Bənə məhbubdur rüxsari-Leyli.
Bənə mətlubdur didari-Leyli.
Anın üftadəsi, məftuniyəm bən,
Anın aşüftəsi, məcnuniyəm bən.
Cəhani-xubanın hüsni sərapa,
Olub gər bir mələksimadə yekca.
Olursa hüsni-Leyliyə müqabil,
Olur nabud bəsani sehri-batil.
Məgər guş etməmişsən bu kəlamı,
Ki, bəst etmiş anı piri-girami:
«Bəre bolbol ze qol əfsane nikust,
Hədise-şəm ba pərvane nikust.
Kəsi kəndər sərəş sövdaye-Leylist

Zi səlami vəzsəadəş ke təsəllist,
Beşirin hər kera peyvənde canəst,
Vüsale-şəkkərəş bər deli giranəst».
Yetib payanə Məcnunin cəvabi,
Edib guş ol pəriru bu itabi,
Dilində rəşk edib peyda bir ataş,
Yaxıldı atəşi-rəşkə o məhvəş.
Degil aşiqlərə, Nakam, mənzur,
Həman yarından özgə çöhrəyi-nur.
Fəğan etdikdə gül eşqində bülbül,
Onu sakit edərmi buyi-sünbül?!

## İBN SƏLAMIN LEYLİNİ ƏQD EDİB DAMAD OLDUĞU VƏ LEYLİNİN BU KEYFİYYƏTDƏN NAŞAD OLUB MÖHNƏTİ-DƏRUNİ İZDİYAD BULDUĞU

Ərusi-dastani-məşşatə dani
Qılıb rəna ərisi-dastani.
Veriblər bu rəvş zivəri-bəyanə.
Ki, ol gün kim, olub Nofəl müzəffər,
Diyari-Nəcdi qılmışdı müsəxxər.
Bilib keyfiyyəti Leyli kəmakan,
Fərəhdən qönçətək olmuşdu xəndan.
Ümidi-vəsləti-didari-Məcnun,
Dəmadəm şövqünü qılmışdı əfzun.
Açıb qalmışdı çeşmin didə bər rah,
Bəsani-didə, banani-rəsədgah.
Yəqinin ki, çərxi-kinəpərdaz,
Dəxi mehr etməgi etmişdi ağaz.
Deyirdi dəmadəm xəndani-xürrəm
Ki, ey dil, xürrəm ol, keçdi dəmi-qəm.
Bulub payan qəmi-hicran zamani,
Gəlib irmiş zəmani-şadimani.
Bu dəm payani-əyyami-bəladır,
Bu dəm həngam i didari-liqadır.
Dəmi-vüslətdir, ey dil, şadman ol,
Təravət bul, Züleyxavəş cəvan ol.
Bu ahəng ilə hər ləhzə sərayan,
Sərvəri cümlə üzvündən nümayan.
Olurkən dəmbədəm ümiidi əfzun,

Edərkən xatirin ümidi məmnun,
Olub məkus nagəh müddəası
Nümayan oldu Leylinin atası.
Kolah fərqi sərində kəc nəhadə,
Cəbini fərti-bəhcətdən güşadə.
Güşad etdi dəhanın, oldu xəndan,
Dedi: «Səd şükr kim, qəm oldu payan.
Əmin oldum bəlayi-nagəhandən,
Rəha buldum bu nəngi-cavidandən.
Edib kanuni-təzviri firuzan,
Olub güftar tizim atəşəfşan.
Füsunim Nofəli dilgərm qıldı,
Dili-sənginin axır nərm qıldı.
Firibim guş qıldı, etdi bavər,
Tərəfdar olmadı Məcnunə digər.
Bənim əmrim bənə təslim etdi.
Qoyub Məcnunu nabəhrə getdi.
Eşitdi Leyli bu qövli-girani,
Dili –azərdə oldu, yandı cani.
Dilində atəşi-qəm qıldı tüğyan,
Atasından vəleykin etdi pünhan.
Həman kim, getdi yanından atası,
Zühurə gəldi matəm macərası.
Axıtdı gözlərindən əşki-gülgun,
Kənarın eylədi əşk ilə pürxun.
Olub piçidə hərdəm narəmidə,
Bəsani-xəsteyi-əfi-kəzidə.
Həman giryan olurdu, ah edirdi,
Dili-suzanın atəşgah edirdi.
Nə ümidi əlində dəsti-məqsud,
Nə dərdin deməkə həmdərd mövcud.
Dili dər suzü ruyi-məclis əfruz,
Güdazində misali-şəmi-cansuz.
Olub nifrinkünan, ginə cuyan,
Bəla küncündə qaldı zarü muyan.
Bulub şöhrət cəhanda bu fəsanə,
Cəmali-Leyli düşdü dastanə.
Olub hər kəs tələbkar vüsali,
Vüsal üçün edirdi bir xəyali.
Nəhayət, xastkaran izdihami,
Gətirdi cünbuşə İbn Səlami.

Ki, filhal eyləyib gəncin güşadə,
Əzimət eylədi Leyli-muradə.
Neçə gənci-nəhan ba dürri gövhər,
Neçə gənci-rəvan ba simü bazər.
Qətar ilə şotrlər cümlə pürbar,
Təmam ol barlər dibayi-zərkar.
Neçə əsb kəhmlani-rəxşpeykər,
Çuli-zəraftə, ətrafi gövhər.
Neçə rumiqulam ənbərinmu,
Neçə Çinkəniz çini-geysu.
Götürdü cümləsin oldu rəvanə,
İrişdi Nəcd-fərxundə-nişanə.
Nişimən eylədi bir xoş məqami,
Kuzidə qıldı bir şirin kəlami.
Rəvanə qıldı kim, olsun mühümsaz,
Anı qılsın cəhan içrə sərəfraz.
Təvəkkül eyləyib məbudə qasid,
Qədəm qoydu rəhi-məqsudə qasid.
Kuzin etdi dəmi-fərruxnişani,
Götürdü namburdə ərmağani.
İrişdi mənzili-məqsudə məsrur,
Hədiyyəsin qılıb təslimi-gəncur.
Ədayi-xoşla müftəh zəbani,
Güşad etdi dəri-gənci-nəhani.
Ki, bu İbn Səlam mahi-peykər,
Xudavəndi-həşəmdir, miri-ləşkər.
Bülənd iqbaldır, sahib hünərdir,
Ona peyvənddür pirüzməndi.
Ki, odur pirüzməndanü sərbüləndi.
Xüsusən qəbləz in həm namizəddir.
Həman əhdə bu mətləb müstəmənddir.
Qərəz, əvvəl qasidi-səncidə güftar.
Məqali-dilkəş ilə axəri-kar –
Edib dilnərm Leylinin atasın,
Hüsuli-mətləbə aldı rizasın.
Qılıb mənzur iqbal ərusi,
Edib surətdə nikufal ərusi.
Riza verdi əgərçi babi-Leyla,
Xətalar eyləyib mənadə əmma.
Sitəm qıldı ərusi-binəvayə,
Anı atdı dəhani-əjdəhayə.

Çü oldu sübh digər mehr ənvər,
Gətirdi gərdişə zərinə sağər.
Quruldu məclisi eyşi-ərusi,
Sipehrin güldü simayi-əbusi.
Açıb gəncinəsin məxdumi-Leyla,
Süruri məçlisin qıldı mühəyya.
Bu canibdən daxi damad dilşad,
Mülukanə edib bir cəşn bünyad.
Çəkildi süfreyi-bəzmi-məsərrət,
İrişdi çərxə həya-huyi-işrət.
Gəlib bəzmə şərabi-ərğəvani,
Dolandı bəzmi cami-şadimani.
Qalıb möhnətdə ancaq Leyliyi-zar,
Cəhan bu surdən oldu tərbkar.
Tərab payan bulub, əqd oldu bəstə,
Dili-aşiqlərin qaldı şikəstə.
Nisar oldu təbəqlə gövhərü zər,
Sənaxan oldu əhli-bəzm yeksər.
Şəbahəngam olub xurşidi-rəxşan,
Dəruni-Məhmməl məğribdə pünhan.
Çəkildi ruyi-dəhrə-pərdeyi-şəb,
Göründü pərdədən bir tazə mətləb.
Mürəttəb oldu bir dilgir əmari,
Mühəyya oldu məhğurani məzari.
Verildi çöhreyi-Leylayə zinyət,
Olub məşşatəsi ənduhü həsrət.
Sirişki-xun idi sürxab ruyi,
Cigər dud idi ətri müşkbuyi.
Olub məhmilnişin mahi-do-həftə,
Dilində möhnətü həsrət nohəftə,
Necə məh menr olub əndər əmari,
Olub gərduni-dunun biqərari.
Digər mətlədən olmaqçün pədidar,
Fələkasa əmari oldu səyyar.
Edərkən tey rəhi-məhd pərizad,
Rikabində rəvan damadi-dilşad.
Həman ol cəmdən bir mərdi-kəmhuş,
Edib Məcnuni-zarin naləsin guş.
Rivan ol canibə getdi şitaban,
Gedib gördü ki, Məcnun pərişan.
Deyib Leyli edər hər ləhzə fəryad,

Tökür çeşmindən əşki-ali-xünzad.
Dedi: «Ey aşiqi-nalan dəxi sən,
Əbəs etmə biyaban içrə məskən.
Ki, sən səhrayə çəkmişsən həsari,
Ğazal olmuş, vəli qeyrin şikari.
Həman ahu olub səndən rəmidə,
Düşüb damə, olubdur aramidə.
Anın eşqində kim, sən dər fəğansən,
Anın dərdilə kim, sən natəvansən.
Sən yad etməyib ol türrəsi xəm,
Gedir məhmildə şuyi-birlə xürrəm.
Edib tərk diyari-mamü babi,
Gedir kim, şuyun olsun kamyabi.
Sən etmişsən qəmi-eşqi dəraquş,
O etmişdir şərabi-işrəti nuş.
Sənin halın keçir üsrətdə nalan,
Onun vəqti keçir işrətdə xəndan.
Sən olmuşsan onun eşqində Məcnun,
O olmuşdur bəri-digərdə məmnun
Bu vəhşətdəh sən qəm nəzari,
O, şuyi-birlə xəndan dər əmari.
Bənə yoxsa sənin gər etimadın,
Odur gör məhmili ol hurizadın.
Bilib Məcnuni-sərgəştə bu hali,
Olub piçidə suzan mu misali.
Rəvan oldu nalan, əşkirizan,
İrişdi məhmilə üftanü xəzan.
Dedi: «Ey afitabi-məhmilara!
Büta, siminbəra, cananara!
Nişat ilə olubsa cüftü dilşad,
Edərsənmi dəxi Məcnununi dəryad?
Necoldu şərti-əhdü dustudari?
Necoldu vədeyi-ümmidvari?
Necoldu verdiyin misaqü iman?
Necoldu etdiginmi sugəndü peyman?
Necoldu yekdil olmaq iddiası?
Necoldu yekcəhətlik macərası?
O dəmlər kim, bənimlə söyləmişdin,
Bənimlə böyləmi əhd eyləmişdin?
Sənin eşqində keçdim candən bən,
Nə cürm etdim ki, tərk etdin bənisən?

Əgər könlün vəfadən rəng buldu,
Ühudü dusti axir necoldu?
Bənim əhdim həman cani canani,
Sənin əhdin imiş yeksər zəbani.
Bulub sən tazə bir yari-dilaram.
Onunla eyləmişsən badə dər cam.
Qədimi aşiqin yad eyləməzsən,
Anı yad eyləyib, şad eyləməzsən.
Nolur qeyr ilə olsan da həmaguş,
Bəni həm etmə xatirdən fəramuş.
Bən oldum bağı-hüsnün bağbani,
Bən etdim anda bülbültək fəğani.
Bən oldum bağı-hüsnündən cigərdağ,
Nə sud, axır ki, oldu bəhrəvər zağ.
Nəhali-qamətin kim, barvərdir,
Bəri əğyarə zəhr kargərdir.
Kani bən etmişəm əşkimlə şadab,
Anın barı olur, əlbəttə, zəhrab.
Səni, ey məh, kim eylərsə dərağuş,
Anı olsun boridə dəstü biduş.
Sənə kim göz tikərsə, ey diləfruz!
Çəkilsin gözlərinə mili-cansuz.
Edib min işveyi-canbəxş peyda,
Verib min vədeyi-ümid bəxşa,
Əlimdən könlüm aldın axırkar,
Alıb könlüm, qoyub getdin məni xar.
Həman dəm kim, sənə dildadə oldum,
Kəməndi-eşqinə üftadə oldum.
Səni boylə güman etməzdim ol dəm,
Degildin bivəfa ol dəmdə sən həm.
Künun noldu vəfa rəsmin unutdun.
Həmin ayini-namərqubi tutdun?
Bəni kim görsə, etdikcə şivən,
Olur vaqif ki, sən peymanşikənsən.
Yazarlar macərayi dastanə,
Anı hifz eyləyər əhli-zəmanə.
Sənin bu əhdi süstin tabəməhşər,
Cəhan içrə olur dillərdə əzbər.
Bu bidadi kim, bən etdim hekayət,
Demə kim, eyləyir Məcnun şikayət.
Ki, səndən şikvə etsəydim əgər bən,

Edərmidim bu vəhşətgahi məskən.
Sənin cövrün bənə rahətfəzadır –
Ki, şəni-aşiqin ancaq rizadır.
Sənin eşqinlədir ancaq xəyalim,
Degil məlumum əsla kəndi halim.
Bəni eşqin edibdir laubali.
Dəxi yox bəndə inü an xəyali.
Sənə aşiq olan aləmdə çoxdur.
Vəli bən tək bəla pamali yoxdur.
Bənəm ol aşiqi-ənduhpişə
Ki, qəmlə xoş keçir halim həmişə.
Dəmadəm möhnətim bulduqca şiddət,
Dərunimdə bulur şiddəti-məhəbbət.
Nə miqdar olsa ənduhi –
Anı nabud edər yadi - cəmalin.
Ki, sən bir nazənin məhliqasən,
Büti-nazikbədənsən, dilrubasən.
Sənin eşqindənəm ol rütbə heyran
Ki, bilməm necədir əhvali-dövran.
Ləbi-ləlin həyati cavidani,
Ona ləbi-təşnə abi-zindigani.
Edər divanə əqli məhi-cəbinin.
Çəkir zəncirə huşi zülfi-çinin.
Cəmalin gülüstani-tazəruyi,
Qədindir sərvi-bustani-nikuyi
İki əbrulərin iki kəmandır,
Müjən tiri-bəlayi-nagahandır.
Gözündür saqiyi-məsti-füsunsaz,
Nigahin səbrsuzü mərdoməndaz.
Bu hüsn dilkəşü bu duşibirlə
Bu naz dilfəribü huşbirlə
Sənə can vermək əmr müxtəsərdir,
Səni tərk eyləmək düşvartərdir.
Nə bidad eyləsən məmnunəmandən,
Ki, cövründür bənə məhbub candən.
Olursə hər səri-muyimdə bir can,
Təmamən eylərəm eşqində qurban.
Bu təqrirati Leyli eylədi guş,
Şüuri-adabini qıldı fəramuş.
Keçib azərmdən, gəldi fəğanə,
Fəğanindən xəcil oldu zəmanə.

Bülənd avaz ilə muyanü giryan.
Dedi: «Ey yari-naşadü pərişan!
Səni bən etmişəm dərdə giriftar,
Səni bən etmişəm divanəkirdar.
Əlilü möhnət olmuşsən bənimçün,
Qətlü həsrət olmuşsən bənimçün.
Sənin dərdin əgərçi bisükundur,
Bənim dərdim vəli səndən füzundur.
Demə kim, Leyli yari-bivəfadır,
Bu əsnadın bənə mütləq cəfadır.
Ki, sən tək bən də eşqə mübtəlayəm,
Sənə dildadəyəm, səndən cüdayəm.
Sənin eşqin bənim cismimdə candır,
Sənin eşqinlə könlüm şadmandır.
Olub pusidə cismi-natəvanım,
Dönüb torpaq olursa üstxanım.
Sənin eşqin birun olmaz dilimdən,
Kiyah eşq olur rustə gilimdən.
Görüb bu haləti olma mükəddər,
Demə kim, Leyli olmuş yari-digər.
Cəhimə xahiş ilə kimsə getməz,
Tənin suzani-nari-duzəx etməz.
Vəli cəbrən sorurlar xah-naxah,
Nə əfğan eyləyir sud andə, nə ah.
Fəğan kim, ölmədən bən bəxti qarə,
Götürmüşlər bəni zində məzarə.
Olub Məcnunə zahir razi-Leyli,
İrişdi guşinə avazi-Leyli.
Təsadüm etdi riş bağrınə niş,
Edib fəryad düşdü xakə bixiş.
Qalıb Məcnun həman bixişü nalan.
Əmari keçdi ol yerdən şitaban.
İrişdi mənzili-dömada məhmil,
O Məhmil içrə Leyli daği-bərdil.
Dəri-gənci-ətasin açdı damad,
Şəkərriz oldu gövhər saçdı damad.
Dəmadəm eyləyib izhari-saziş,
Edib Leyliyə min gunə nəvaziş.
Ona verdi ümuri-ixtiyarın,
Ona təslim qıldı cümlə varın.
Müdara eylədi bir neçə əyyam.

Həman simintəni etməkçün ram.
O məhvəşlə olub küstax axir.
Qılıb dərdi-dilin naçar zahir.
Tələbkar kənarü bus oldu,
Tələbi məkus olub, məyus oldu.
Həman Leyli bəsani-şiri-madəh,
Anı bir müşt ilə qıldı fitadəh.
Dedi İbn Səlamə: «Keç cəfakar!
Bu kirdari əgər etsən digərbar,
Mükafatın digərgunə bulursən,
Qətli-xəncəri-həsrət olursən.
Xudayi-qadiri-yektayə sokənd!
Ki, etmişdir bəni boylə şəkərxənd.
Bənimlə sülh qıl, istər sətizə,
Tənim istərsən eylə rizə-rizə,
Sənə bəndən vüsal olmaz müyəssər,
Ümidin nəxli olmaz baravər!
Ki, hüsnüm əndəlibi sən degilsən,
Bənim dərdimin təbibi sən degilsən».
Bu sokəndi, bu göftarı qılıb guş,
Bu zəhramiz cami eyləyib nuş.
Yəqin oldu həman İbn Səlamə
Ki, namüəssərdir yetmək məramə.
Vüsal üçün qılıb bir də iradə,
Əgər əbram edər olsa ziyadə
Qalıb canan, gedər ya can əlindən,
Qalar ya can, gedər canan əlindən.
Görüb Leylini olmuşdu giriftar
Bu halətdən qalıb məbhutü naçar.
Bəlayi-firqətə qıldı təəmmül,
Məramindən keçib etdi təhəmmül.
Çəkib bir xətt təmənnayi-vüsalə,
Olub qane tamaşayi-cəmalə.
Dedi Leylayə kim: «Ey şahi-xuban!
Degil xali xətadən hali-insan.
Hüzurində əgərçi rusiyahəm,
Vəlikən tövbəkarəm, üzrxahəm,
Qələm tək cürmümə, puzüşnəzir ol!
Nolur üftadəqanə dəstgir ol!
Həman didarın ilə qaiməm bən,
Həram etmə bənə didarin sən.

Ki, bir didarini görməklə şadəm,
Təcavüz etsəm, andən bədnəhadəm.
Günə boylə keçib İbn Səlamin
Edib mətruk icrayi-məramin,
Təmənna etməyib Leyli vüsalin.
Edirdi məhz bir röyət cəmalin.
Qalıb ənduh ilə biçarə Leyli,
Diyari-hicrdə avarə Leyli.
Çıxırdı xeymədən gəh laubali,
Gəzirdi subəsu Məcnun misali.
Gedirdi damani-səhrayə gahi,
Cəhani tar edirdi dudi-ahi.
Tökürdü gözlərindən əşki-alin,
Edirdi cüstücu Məcnunun halin
Nə yerdə olduğun cuyan olurdu,
Həman Məcnun deyib muyan olurdu.
Bulub şiddət dəmadəm dərdi-həsrət,
Qıib tüğyan dilində suzi-firqət.
Nə şövhərdən dəxi azərm qıldı,
Nə madərdən, pədərdən şərm qıldı.
O rütbə etdi ahi aşiqanə,
Ki, oldu eşqi məşhuri-zəmanə.
Budur, Nakam, eşqin müqtəzasi,
Ki, üşşaqin olub əfzun cəfasi.
Gərək fərsudeyi-dərd olsun aşiq,
Həmişə dərdpərvərd olsun aşiq.

## MƏCNUN DİLXUNUN DƏRDİ-BİHƏDDİ ƏLACINDAN PƏDƏRİ XƏSTƏCİKLƏRİ NAÜMİD OLDUĞU VƏ CÜSTCUYİ-BƏYİDİ-BƏDİNDƏ MƏCNUNLA MƏLAQİ OLUB VƏ BƏDRUDİ-CANFƏRSUD QILIB VƏFAT BULDUĞU

Edənlər əhli-məbhəsdəən hekayət
Bu üslub üzrə etmişlər rəvayət –
Ki, Məcnuni-cigərxunun atası,
Olub ənduh cansuzun xudası.
Əlac etmək üçün Məcnuni-zarə
Cəhangəşt oldu getdi hər diyarə,
Kimi gördüsə, oldu çarəcuyan,

Vəli bulmadı dərdi-eşqə dərman.
Olub naümid puri səhhətindən,
Xəm oldu qəddi həsrəti-möhnətindən.
Düşüb taqətdən oldu piri-fani.
Tənində qalmadı tabü təvani.
İrişdi rəhləti-həngami axir,
Əlaməti-vəfati oldu zahir.
Təvəhüm qıldı kim, etdikdə rəhlət
Edib biganə dəvayi-vərasət.
Üçarü malini tarac edərlər,
Anın Məcnunun möhtac edərlər.
Bulub Məcnununi bir daxi təkrar,
Ani halindən etmək üçün xəbərdar.
Götürdü bir neçə mərdi-cəvansər,
Əzimət qıldı anlarlə bərabər.
Əsabərdar olub oldu şitaban,
Dolaşdı kuhdə, səhradə heyran.
Təcəssüm eyləyib Məcnuni-zari,
Gəzirkən subəsu kuhisari,
Eşitdi nagəhan kari bir əfğan,
O əfğan canibə getdi şitaban.
İrişdi bir məqami-hövlnakə
Bəsani-guri-tirə bir məğakə.
Baxıb gördü ki, cayi-kədərdir,
Nəhadi-bəddilan tək tirə-tərdir.
Cüdari narü, fəriş səngi-xara,
Nişani-duzəx andə aşkarə.
Bu heyrətgahdə Məcnun diltəng,
Kəbabasa olub cəsbideyi-səng.
Gedib şəxsiyyəti, qalmış fəğani,
Əyan olmuş tənində üstxani.
Misali qalibi-biruh xamuş,
Düşüb səng üzrə qalmış məstü bihuş.
Görüb Məcnuni bu halətdə babi,
Kəsildi taqəti, məhv oldu tabi.
Olub ol şəmeyi-dilsuzə fanus,
Dərağuş etdi, çeşmin eylədi bus.
Güşad etdi gözün Məcnuni-bixiş,
Göründü çeşminə bir şəxsi-dilriş,
Vəli fəhm etmədi kimdir o zar,
Nəçün gəlmiş, nəçün olmuş tələbkar.

O kim fəramuş edir kəndi şühudin,
Edərmi fəhm digərlər vücudin?
Birində gördü çün naşad babin,
Təfərrüc etdi babi-iztirabin.
Qılıb simasinə bir dəm nəzarə,
Şənasan olmadı, durdu kənarə
Dedi: «Kimsən, nədir məndən sualın,
Bəyan eylə, nədirsə vəsfi-halin?
Nə üçün salik olub pürxof rahə,
Gəlibsən həy ikən bu gurgahə».
Gəlib göftarə giryan babi-Məcnun
Dedi:»Ey puri-məftuni-cigərxun!
Mənəm babin sənin, ey nuri-didə!
Bu gunə, dilpərişan, qəmrəsidə».
Çü Məcnun fəhm edib bildi atasin,
Rəvan bus etdi damani-qəbasin.
İki muştaq edib yegdigərin bus,
Töküb hər ikisi xunabi-əfsus.
Olub dirinə dərdin biqərari,
Fəğanlər eylədilər iztirari.
Qılıb xamuş sirişkin babi-Məcnun,
Baxıb Məcnuninə məhzunü məhzun.
Təni gördü ki, üryandır sərasər,
Bəsani-üryan dəşti-məhşər.
Açıb bir buqçeyi-zərtari-ziba,
Çıxartdı xələti-mümtazi-diba.
Müləbbəs etdi sər ta payi cismin,
Güşadə ekylədi bəndt-tilsimin.
Dedi: «Ey puri zarü müstəməndim,
Yetər, insaf qıl, guş eylə pəndim.
Töcavüz eyləmiş ömrün cəhldən,
Birun et daxi bu təşvişi dildən.
Yetər sövda, yetər bu eşqbazi,
Baxıb əhvalinə tərk et məcazi.
Təni gördü ki, üryandır sərasər,
Bəsani-üryan dəşti-məhşər.
Açıb bir buqçeyi-zərtari-ziba,
Çıxartdı xələti-müsmtazi-diba.
Müləbbəs etdi sər ta payi cismin,
Cüşadə eylədi bəndi-tilsimin.
Pənrar getmisdi.

Dedi: «Ey puri zarü müstəməndim,
Yetər, insaf qıl, guş eylə pəndim.
Təcavüz eyləmiş ömrün cəhldən,
Birun et daxi bu təşvişi dildən
Yetər sövda, yetər bu eşqbazi,
Baxıb əhvalinə tərk et məcazi.
Səninlə dustun çün oldu düşmən,
Kimin yadilə daxi ah edirsən?
Səni bədhal edibdir eşqi-Leyli,
Vəlikən Leylinin yox səndə meyli.
Sən olmuşsan anın eşqində nalan,
O olmuş şöhvər ilə şadü xəndan.
O kim, qılmaz səni bir ləhzə dəryad,
Anın yadilə sən həm etmə fəryad.
Sən eylərsən anın hicrində şivən,
O eylər xaneyi-əğyari rövşən.
Yetər bu etdigin bica təkapu,
Əgər sövdayi-xam isə yetər bu.
Yıxıldın atəşə gümanam qaldın,
Vəli napüxtə oldun, xam qaldın.
Olur hər vəqtdə bir şövq qalib,
Olur hər nəfs mətlubə talib.
Təəşşüqdür hünərməndani-kəmali,
Əgər keçməzsə həddi-etidali.
Nəçün vəhşilər ilə yar olursan,
Bəşər ikən vəhişətvar olursan
Vəhuş ilə yetər ünsiyyət etmək,
Təriqi-vəhşətə bəsdir bu getmək.
Zəmani-rəhlətim olmuş yəqinim,
Gəl, ey cani-pədər, ol canişinim.
Cənazəmdə bənim sən olmaz isən,
Səni eylər məlamət dust, düşmən.
Rəva görmə ki, bən etdikdə rəhlət,
Edə gəncinəni biganə qarət.
İriş sərvətimə fövtündən əqdəm,
Bəni dünyada qıl bir ləhzə xürrəm.
Vəfatimdən səni etdim xəbərdar,
Təğafül eyləmə, ey pur, zinhar!
Gələrsəən zarü giryan bir zamanda,
Ki, bulmazsan bəni ol dəm cahanda.
Dərağuş eyləyib məhzunü məyus,

Edərsən qəbrimin torpağını bus.
Sirişkəfşan olarsan, ah edərsən,
Dəmadəm naleyi-canxah edərsən.
Bənə sud etməz ol dəm dudi-ahin,
Olursa filməsəl gər… ahin?
Bənim bu pəndimi guş etməz isən,
Bənimlə bir rəvişdə getməz isən,
Cəhandan eylərəm həsrətlə rəhlət,
Pərişan qalaram ruzi-qiyamət.» /?\
Bulub payan bu pəndi-müşfiqanə,
Anı guş etdi Məcnuni-yeganə.
Dedi: «Ey validi-müşfiq, kərəm qıl,
Bəni əfv eylə, məarüfül-qələm qıl.
Həvasim eşğilə məşğul olubdur,
Digər əşğalədən məzul olubdur.
Eşitsəm də əgər sövti-məqali,
Nədirsə bilməm ol qövlün məali.
Səni bildim ki, babamsən, edib guş,
Vəlikən etmişəm namin fəramuş.
Fəramuş etdigim bir sən degilsən,
Bəni həm fəhm qılmam kim, nəyim bən?
Kiməm bən, ya nədir namü nişanim,
Nəçündür bu əninim, bu fəğanim.
Təcəlla eyləyib ənvari-Leyli,
Bəni oylə yaxıbdır nari-Leyli
Ki, bilməm aşiqü məşuq kimdir,
Yaxan kim, ya olan məhrər kimdir.
Bənə dersən bu vadidən fərar et,
Bu vəhşətcahdən qalxıb güzar et.
Necə qalxım, dilimdə bari-qəm var,
Bir döşümdə min kuh ələm var.
Olub amas payi-iqtidarim,
Fərarə qalmamışdır ixtiyarim.
Bu yolda olumşam ol rütbə ruyan-
Ki, bulmaz oudətim bir daxi imkan.
Bəni təklif edirsən xanimanə,
Necə əzm eyləyim bən ol məkanə –
Ki, yoxdur yari-dilcu ol məkandə,
Kim ilə bən bulum aram aidə?
O gunə olmuşam vəhşətdə xugər –
Ki, buyi-ünsdən dil nifrət eylər.

Vəfatımda deyərsən ol əzadar.
Qəbul eylərdim olsaydım səzavar?
Ki, mürdə üzrə eylər zində şivən,
Nə hasildir bənimtək mürdədildən?
Vəfat etdim, hesab et tifl ikən bən.
Dəruni xakdə dəfn eylədin sən».
Bu göftari eşitdi nuri-naçar,
Yəqin etdi ki, Məcnun diləfkar
Giriftar olduğu dərdi-dərundar
Əlacı həddi-imkandən birundir.
Əlacı həddi-imkandən virindir.
Əlacından çəkib əl, oldu naümid,
Ziyadə qılmadı ibrami təkid.
Dedi: «Ey canımın cananı fərzənd!
Əbuyi-natəvanın canı fərzənd!
Nə irad eylər oldunsə eşitdim.
Daxi səndən ümidim qət etdim.
Künun gəl bus edim bimar çeşmin,
Bəni görməz dəxi xunbar çeşmin.
Dərağuş eyləyib bir daxi təkrar,
Səni bərdud edim, ey aşiqi-zar!
Ki, bən əzm eylər oldum bir diyarə,
Yox ondan bazgəştə rahi-çarə».
Çəkib ağuşunə məcnuni cantək,
Qılıb dərbər onu ruhi-rəvantək.
Dedi: «Bedurud, ey puri-cigərxun!
Qəribü bikəsü məftunü məhzun.
Cahandən köçmək ki, oldu müqərrəd,
Dilimdə qalda dağın ta bəməhşər».
Digər yerdə qılıb fəryadü əfsus,
Edib Məcnuni-zarin gözlərin bus.
Dedi: «Bedurud, ey fərzanə fərzənd,
Cahanda olmadın bir ləhzə xorsənd.
Dilim səd çakdır bu macəradən,
Gözüm nəmnakdır bu macəradən.
Bu qəmlə irtihal etsəm gərəkdir.
Məzarə dərd ilə getsəm gərəkdir.
Yaxıldı bağrım içrə dahi-həsrət
Ki, baqidir bu həsrət ta qiyamət.
Künun gülabanundən sən olma xamuş,
Bəni həm gahü gah qılma fəramuş

Ki, sənsən gülşəni-eşqin həzari.
Bu gülşən görməsin sənsiz bəhari.
Bulub payani-dürud piri-xəstə,
Edib bədurur, getdi dilşikəstə,
İrişdi mənzilə rəncuri-giryan,
Qalıb bir-iki gün dərd ilə nalan.
Tutub axər əcəl damani-canin,
Rəha qıldı qəmindən bu cəhanın.
Təzrvi-ruhi oldu rəsteyi-dam,
Çəmənzari-cənanındə buldu aram.
Degil dynya məkani-payidari,
Budur dünyayi-dunun etibari
Ki, bir kəslə vəfadar olmamışdır.
Vəfa rəsmində paydar olmamışdır.
Bu dünya bir gürüsnə əjdahadır,
Təni-mərdüm ona daim qidadır.
Kimi kim, eylər olsa nəzpərvər,
Anı həm aqibət bir loğma eylər.
Cahanda sər ta sər hər zərreyi-xak,
Bir ahu çeşmidir, ya bir dil çak.
Olanlar bəstəri-qəflətdə dərxab,
Fəribi-dövrdən olmaz rəhayab.
O kim qafil degil bidar dildir,
Odur varəstə kim, hüşyar dildir.
Əla, ey qafil, məğrurü dər bənd,
Cəhanda guşişi-bibəhrə taçənd.
Qürur etmə cəhandə mülkü malə.
Ki, mülkü maldır bais vəbalə.
Degil həmrəh sənə xak içrə malin,
Səbükbar ol, təfəkkür eylə halin:
Bəsa mümsük ki, gənci qıldı əmsak,
Künun xak içrədir məhcurü qəmnak.
Saqın, Nakam, məsti-xab olma!
Bu qəflətxanədə bitab olma.
Qalırsan birzaman xak içrə xamuş.
Olursan yadi-aləmdən fəramuş.
Künun bidar olub qıl tuşə hasil,
Keçirmə ömrünü bihudə qafil.
Tahi-dil ol, Məsihavət cəhandən,
Səmayə qıl güzər bu xakdandən.

## MƏCNUNUN VƏFATI-PƏDƏRİNDƏN XƏBƏRDAR OLDUĞU VƏ GEDİB TÜRBEYİ-PƏDƏRİNİ ZİYARƏT QILDIĞI

Çün Məcnun validin naümid qıldı,
Fəğani rəsmini təcdid qıldı.
Edib hər ləhzə fəryadi-cigərsuz,
Gəzirdi kuhdə giryan şəbü ruz.
Qəzara bir gün ol şeydayi-dilxun,
Cülus etmişdi bir vadidə məhzun –
Ki, seyd əzmlə bir səyyad andə
Gəmingah eyləmişdi ol məkandə.
Görüb Məcnuni-zari oldu giryan,
Fəgan etdi bəsani sugüvaran.
Dedi: «Ey aşiqi-divanə, ətvar,
Olubsan eşqdə biganə girdar.
Kənar oldun həmişə validindən,
Anı bir ləhzə xoşnud etmədin sən.
Əgər aləmdə bəxti qarə Babək,
Bəla fərsudəsi biçarə Babək.
Sənin tək puri hərgiz bulmasaydı,
Sənintək yadigarı olmasaydı,
Həzaran bar bundan şad olardı,
Qeyudi dərddən azad olardı.
Həyatında olmadın ona övlad,
Matəminlə künun bir dəm qılıb şad,
Məzarin get ziyarət eylə, bari.
O pirin bir zəman ol suguvari.
Şitab et, durma boylə laubali.
Məzari-xakinin ol ruyi-mali.
Ziyarət qıl anı, guş eylə bəndən,
Ki, olsun qəbdə xoşnud səndən.
Bilib keyfiyyəti Məcnuni-məhzun,
Olub əndazədən ənduhi-birun.
Xəm etdi qamətin manandeyi-çəng,
Tutub guşin fəğanə qıldı ahəng.
Urub hər ləhzədə min daşə başın,
Daşı ləl etdi, tökdü qanlı yaşın.
O rütbə ağladı bihuş oldu,
Misali-mürdəqan xamuş oldu.
Gəlib huşə, əzimət qıldı rahə,

Şitaban getdi, yetdi görgahə.
Görüb məxduminin xaki-məzarin,
Bülənd etdi sədayi-ahü zarin.
Məzari şüşəsin qıldı dərağuş,
Öpüb xaki-məzari, oldu bihuş.
Müraət etdi babi-ruhi-pakin,
Gülabi əşkilə tər qıldı xakin.
Gəhi xaki-məzari etdi dərbər,
Gəhi ah etdi, qıldı xaki bərsər.
Şəbahəngam Məcnuni-siyəhruz.
Edib ahin çirağı-türbətəfruz.
Görüb qəmxarini xak içrə pünhan,
Mükəddər oldu halı, qıldı əfgan.
Dedi: «Ey pədər! Ey babi-qəmxar!
Yetim etdin bəni, qoydun diləfkar».
Sərayəndə olub əşari-dilduz,
Dəmadəm eylədi ahi-cigərsuz.
Olub rumal xakə ah etdi,
Töküb qan, naleyi-cangah etdi.
Dedi: «Hali xərabəm, ey pədər, han!
Qəmidən dilkəbabəm, ey pədər, han!
Sən idin qəmxarim, püştü pənahim,
Sən idin rəhnumim, piri-rahim.
Kimi əknun bulub, qəmxar edim bən, .
Kimə dərdi-dilim izhar edim bən?
Fəğan kim, qalmışam gümrah sənsiz,
Sərəncamım yamandır ah, sənsiz.
Diriğa, tutmadım, etdin nəsihət,
Künun oldum giriftari-fəzihət.
Edib üsyan səni azürdə qıldım.
Dilin naşad edib, əfsurdə qıldım
Diriğa etmədim xoşdil səni bən,
Gör imdi halimi, əfv et bəni sən.
Olub hər ləhzə həqqində günahkar,
Günahim əcrinə oldum giriftar.
Bəni xülqi-bədim qıldı pərişan,
Günahimdən peşimanəm, peşiman.
Kərəm qıl, eybimi sərkub qılma,
Günahimlə bəni mənkub qılma.
Olub xoşnud əgər bəndən bəni sən –
Bəhl etməz isənsə, vay bərmən!

Bu dunə ziccədən nalanü qəmnak,
Edib rüsxarini fərsudeyi-xak.
Səhərgəh çünki mürğani-səhərxan,
Bəsani-aşiqan oldu xuruşan
Xuruşan oldu Məcnuni-diləfkar.
Gənə səhrayi-Nəcdə getdi naçar,
Həmişə nalə qıldı, oldu giryan,
Həmarə ah qıldı, etdi əfğan.
Xəzani-qəm yaxıb ömri-bəharın,
Keçirdi dərd ilə leylü nəharın.
Bir atəşdir təəşşüq afiyətsuz,
Bulur şiddət ləhibi ruz bər ruz.
Ki, aşiqin məbdən, Nakam, qəmdir.
Nəhayət mərkəzi darül-ədəmdir.

## MƏCNUNUN QEYDİ-HƏSRƏTDƏN VARƏSTƏ OLDUĞU VƏ VƏHŞÜ SÜBA BİRLƏ ÜNSİYYƏT BULDUĞU

Biyaban içrə Məcnuni-bəlakəş,
Qalıb möhnətlə bir müddət dər atəş.
Diyari-yarə bir gün əzm qıldı,
Şitaban oldu, əzmin cəzm qıldı.
Gedərkən bir səhifə gördü nagəh
Tamaşa qıldı ondan oldu agəh
Ki, nəqş olmuşdu onda bikəmü biş,
Həmana Leyliyü məcnuni-dilriş.
Urub sərpəncəyə təsviri-nigarə,
Həman təsviri qıldı parə-parə
Buraxdı kəndi təsvirin səlamət.
Görənlər qıldı Məcnuni məlamət.
Dedilər kim, nəçün ey aşiqi-şum,
Biruz etdin bu gunə kari-məzmum?
Edirdin çünki bu əmrə cəsarət,
Nəçün qıldın ədəb rəsmində qəflət?
Nigarin peykərin qıldın dəridə,
Həman tənha sənə qaldı cəridə?
Açıb Məcnun dəhani-dürfişanın,
Cəvabın verdi ərbabi-kəmanın.
Dedi: «Ey guşeyi-qəflətdə məstan,
Cəhalət pişəkanu xudpərəstan,

Rəhi-binəşdəsiz, məyublarsiz,
Ki, bu əsrardən məhcublarsiz.
İkilik eşqdən məktum olubdur,
Qalıb bir digəri mədum olubdur.
Nəçün bir üzrə bir də olsun əfzun,
Həman Leyli bənəm, Leyli də Məcnun.
Degil şayəstə kim, təsviri-yarə
Edə əğyari-naqabil nəzarə.
Bəənim rəsmimdədir ol nəğz məktum,
Anınçün eylədim ol rəsmi mədum.
Ki, eşq içrə niqabdustəm bən,
O məğzi xalis, ancaq pustəm bən,
Cəsəddir aşiqan, məşuqdur can,
Cəsəd peyda gərəkdir, ruh pünhan.
Edib irad bir türfə qəsidə,
Rəvan səhrayə getdi ol rəmidə.
Olub giryan həmişə qıldı nalə,
Mübəddəl oldu hali qeyri halə.
Yaxıb nəfsin, olub mədumolasar,
Təəyyüş qıldı aləmdə mələkvar,
Vəhuşə yar olub aram buldu,
Ona dərəndəgan həm ram oldu.
Sərasər cümleyi-vəhşi-biyaban
Onun ətrafına oldu şitaban.
Məqami=xabinə olduqda xüftə,
Domilə eyləyib rubah rüftə,
Mütəkkəsi olurdu rani-ahu,
Kafi pəri-bülbül, bali-tiyhu.
Nəvazişlər qılıb ahuyə hər dəm,
Olub əksər zaman ahuyə həmdəm,
Edirdi yad çeşmi-dilsitanin,
Qılırdı bus çeşmi ahuvanin.
Edib gəh lütf şiri-tizcəngə,
Olurdu mültəfit gahi pələngə.
Gəvəznü gurü bəbrü şirü rubah.
Çəkib səflər bəsani-ləşkəri şah.
Olub Məcnunə yeksər bəndə fərman,
Güruhi vəhşə məcnun oldu sultan.
Ki, hökmü nafiz oldu marü murə,
Təsəllüt eylər oldu şirü gurə.
Şükuhi oldu bir həddə rəsidə,

Ki, oldu cümlə vəhşi aramidə.
Qənəmlə gürg həm şir ilə ahu,
Bulub üns oldu yekdigərlə yekru.
Nə suyə eyləsəydi əzm Məcnun,
Gəzib Məcnun ilə həmin ba hamun,
Cüda olmazdı Məcnundən bu ləşkər,
Gedərlərdi onun əqəbində yeksər.
Cülus etdikdə Məcnun bir busatə,
Qılıb piramunun cayin əhatə,
Çəkib ətrafına möhkəm hasari,
Olurlardı o şahın pasidari.
Təvəhhüm eyləyib dərindigandən
Güzər qılmazdı bir kəs ol məkandən.
Kimə olsaydı Məcnundən icazət,
Ona izhar edərlərdi məhəbbət.
Kimə kim, olmasaydı yar Məcnun,
Anı eylərlər idi qərqeyi-xun.
Olub dərəndəgan yeksər qulami,
Cəhani qıldı heyran ehtişami.
Olanlar eşqdə, Nakam, kamil,
Olurlar rütbeyi-əlayə nail.
Olub axır səriri eşqə şayan,
Təəşşüq etdi Məcnuni Süleyman.

## ZEYDİ-BAVƏFANIN TƏRCÜMEYİ-HALI VƏ MƏCNUN BASƏFA İLƏ SƏBƏBİ-İTTİSALİ

Müfəssəl söyləyib fərzanə ustad,
Hədisi-eşqi boylə qılmış irad –
Ki, növrəs bir cavan, sərvi bala,
Sərapa cümlə əndami dilara.
Yüzü – Mehri-səmayi-xubruyi,
Gözü – ahuyi-səhrayi-nikruyi.
Ləbibi dilkəşü xülqi girami,
Ədibi bərguzidə, Zeyd nami.
Dili peyvəstə sövda payi-bəndi,
Həmişə gərdənində qəm kəməndi.

Məhəbbət caminin peyvəstə məsti,
Bəharistan eşqin moğpərəsti.
Cününi-zənciri boynunda nəhani,
Təriqi-eşqdə Məcnuni-sani.
Bu bəxti qarə, yəni zeydi-dilxun,
Təəşşüqdə olub həməsri-Məcnun.
Bir afətkarə olmuşdu giriftar,
Əmisi düxtəridi ol pərivar.
Necə düxtər ki, bir rəxşəndə əxtər,
Cəmali Mehri-ənvərdən münəvvər.
Yüzü tabəndə, zülfü ənbərfam.
Ədasi nazəni nü nazik əndam.
Qəddi sərvi-rəvani-baravər,
Bir canpərvəri innabü şəkkər.
Mübərra bəhs qismindən dəhani,
Müərra ümqündən tuli-muyani.
Büti-şəkkərləbü məhbubeyi-taq,
Zəmanin fitnəsi, aşubi-afaq.
Nədimi-tari-zülfü leylayi-qədr,
Səcəncüldar rüxsari məhi-bədr.
Çirağı-xaneyi-diltab ruyi,
Büxuri-məcmər cam buyi-muyi.
Zənəxdani həman narinci-Kənan.
Həvasindən büridə dəsti-xuban.
Nigahi-qəmzəsi caduyi-Babül.
Ləbi şəkkərşikən, rüxsarəsi gül.
Sərapa mübamu əndami zinət,
Vücudi zeybi-aləm, nami Zinət.
Fərağət bulmayıb həm bu diləfruz,
Ləhibi-eşqdə qalmışdı dər suz.
Ki, olmuşdu əsiri-xəsteyi-Zeyd.
Olub aşüfteyi-dilbəsteyi-Zeyd.
Anın eşqində həm Zeydi-diləfkar,
Olub sübhü məsa nalanü xunbar.
Qılıb əmmilə bir müddət müdara,
Məramın qıldı axır aşikara.
Əmmi-qəddari qıldı Zeydi məhcur,
Təni-məqsudin etdi Zeyddən ur.
Ki, mülkü maldən Zeydi-hünərvər,
Fəqir idi, vəli əmmi tavankər.
Bu eyb ilə olub məhrumi-didar,

Müyəssər olmadı didari-dildar.
Qılıb dərbənd əmmi düxti-zarin
Həzarindən nəhan etdi baharin.
Bulub bir mərdi-dun, əmma tavankər,
Anı Zinətlə axır qıldı həmsər.
Ümidin kəsdi çün Zeyd ol mələkdən,
Keçirdi naleyi-zarin fələkdən.
Deyirdi eyləyib ahi-cigərsuz –
Ki, bir kəs olmasın bən tək siyəh ruz.
Olub ənduhi gün-gündən ziyadə,
Qəmi-firqətdən oldu üftadə.
Sitəm zənciri birlə payi-bəstə,
Pərişanü mükəddər dilşikəstə.
Dilində daima canan xəyali,
Edirdi nalələr Məcnun misali.
Əsiri-dərd, həm biçiz, dərviçi,
Sinani-qəmlə həm olmuşdu dilriş,
Olub biganə yarü aşinasi,
Anı tərk eyləmişdi əqrəbasi.
Cəvari-xaneyi-Leylidə ol zar,
Qılıb məskən edirdi nalə hər bar.
Bəlayi-eşqdən dilxəstə Leyli,
Qeyudi-dərd ilə pabəstə Leyli.
Anın halindən olmuşdu xəbərdar,
Anı təltif edirdi ol pərivar.
Edirdi gahü gah mehmani-xani,
Sorurdu suzi-pünhanın nihani.
Qılıb həmdərd həmdərd ilə saziş,
Edib ol zarü məhcurə nəvaziş.
Ona razi-dərunin söyləmişdi,
Anı halindən agah eyləmişdi.
Əgər Məcnunə biaram Leyli
Edər olsaydı bir peyğam Leyli,
Olub ixlaskeş Zeyd vəfakiş,
Olurdu qasidi-ixlasəndiş.
Pəyami eyləyib Məcnuni məmnun,
Nəvazişlər edirdi Zeydə Məcnun –
Ki, olmuşdu hərifi-qəmküsari,
Rəfiqü həmdəmi peyki-nigari.
Görüb dərəndəgan Zeydi mükərrər,
Anınlə aşinə olmuşdu yeksər.

Neçə əşar kim, Məcnuni-naşad
Edirdi canibi-Leylayə inşad,
Həman dəm eyləyib bir nüsxə tərqim,
Edirdi Leyliyi-məhruyə təslim.
O idi naməbər, həm namə avər,
İki aşiq miyanində pəyambər.
Bu üslub üzrə bir gün Zeyüd dilxun,
Verib peyğam, edib Məcnuni məmnun.
Edirdi guş Məcnunun xitabın.
Qılırdı guş peyğami cəvabın.
Açıb güftarə ləb Məcnuni-şeyda,
Bədahi bir qəsidə qıldı inşa.
Səlisü dilpəsəndü bikr məzmun,
İbarati bəsani-dürri-məknun.
Qılıb Zeydə əsər bu nəzmi-dilkəş,
Təəssüf eylədi Zeydi-müşəvvəş.
Dedi Məcnunə kim, xanimansuz,
Güruhi-arifanə daneşamuz.
Həman dil kim, bu gunə durrfəşandır,
Əcəbdir kim, nəçün divanəsandır?
Bu danişlə cünunluqdan nə hasil
Ki, danişdir həman şayani-aqil.
Məqalın payəsində əql qasir,
Vəli halin məqalindən müğayir.
Əgər hüsnü sifətdə bir mələksən,
Degilsən Zeyddən əmma ki, əhsən.
Məni seyr et ki, oldum didəgiryan,
Fəraqi-yardə səndən pərişan.
Riza verdim qəzayə axəri-kar,
Şəkiba oldum, etdim səbr naçar.
Yetər aşüftəlik, sən həm həzər qıl,
Cəhandə namü şənin mötəbər qıl.
Ki, sədr bəzmi-danişin məqamin,
Yazıqdır, olmasın divanə namin.
Həvayi-nəfsdən azadə Məcnun
Bu töhmətdən olub hali digərgun.
Bilib Zeydin təmannayi-dərunin
Edib səncidə əhvayi-dərunin.
Dedi: «Ey Zeyd, tul etdin məqali,
Təcavüz etmə həddi-etidali.
Pəyamin söylə sən, ey peyki-dildar!

Ziyadəgu olub, olma dilazar.
Ki, elmindən sənin cəhlin füzundur,
Məqalin həddi-elmindən birundur.
Nəçündür söyləyib divanə namim,
Nəzərdə tutmayırsan ehtiramim.
Ki, divanə odur kim, xodstadir,
Əsiri-daneyi-dami-həvadir.
Bən ol fərzanəyəm kim, divbəndəm,
Nəinki divanbəndində nəjəndəm.
Qalıb aləmdə bən dərdam divi,
Bənə gər etməsəydim ram divi.
Edib vəhşəti fərmuş olub ram,
Bənə olmazdı bəndə bu dədü dam.
Bəraətdir, dəyanətdir siriştim,
Bikadır, ibtiladır sərnəviştim.
Güman etmə kim, bən məstü həvayəm,
Pərəstari-həvayi masəvayəm.
Cəhan bir cahdır kim, qəri nayab,
Qalıb üftadəsi naçarü bitab.
Olub azadə ənduhi sitəmdən,
Rəha bulmaq üçün bu cahi-qəmdən.
Həmin çah içrə batədbiri-təqdir,
Olubdur eşq zənciri sərazir.
Bu zənciri edib dərdəst hər kəs,
Bu zəncirə olub pabəst hər kəs.
Tutub möhkəm güzər qılsa həvadən,
Olur varəstə çahi-masəvadən.
Həman zəncir zülfi-dilbərandır,
Ona dilbəstəqan varəstəqandır.
Həmana etməyib bən həm təğaful,
Bu zəncirə verib dil bitəhəmmül.
Olub nabəndi-zənciri-məhəbbət,
Əlimdə daməni-piri-məhəbbət.
Qüsəsdə eyləyib zünnari-nəfsi,
Yaxıb nabud edib asari-nəfsi.
Büti-amali qıldım parə-parə,
Yıxıb bütxanəyi çıxdım kənarə.
Əcəl tutmazdən əqdəm damanimdən,
Olub üryan keçib damanindən bən.
Əvaiqdən, əlayiqdən olub dur,
Mühəyyayi-səfər amadeyi-gur.

Cəhandə hər nə kim, olmuş pədidar,
Qılıb tərk olmuşam hala səbukbar.
Əgər divanə kirdari budursa,
Əgər Məcnunun ətvari budursa,
Həman divaneyi-naqafiləm bən,
Həman Məcnun, həman danadiləm bən.
Bu təqriri-bəliği Zeyd edib guş,
Xəcalətdən olub heyranü xamuş,
Təəhhüd qıldı kim, bica digərbar,
Bu günə olmasın hərgiz dilazar.
Verib Məcnunə Leylinin pəyamin,
Qılıb təbliğ ona yari-Səlamin.
Götürsün xətti-Məcnuni açıb bal,
Yetirsin, eyləsin Leylini xoşhal.
Təriqi-eşqi tut, Nakam, möhkəm,
Desinlər eşqdə Məcnun sənə həm.
Ki, eşqə əql əvvəl rəh nümadır,
Dəli-aşiqan feyzi-xudadır.

## MƏCNUNUN KƏVAKİBƏ ƏRZİ-HACƏTİ VƏ NƏCMDƏN ƏRAZ EDİB DƏRGAHİ-XUDAYƏ MÜNACAT QILDIĞI VƏ ZEYDİN CANİBİ-LEYLİDƏN MƏCNUNƏ NAMƏAVƏR VƏ TƏRƏFİ-MƏCNUNDƏN LEYLİYƏ NAMƏBƏR OLDUĞU

Fərazi-kuhdə bir gecə Məcnun
Fəraqi-yardən giryanü dilxun.
Qılıb hər dəm sürudi-aşiqanə,
Nəzarə eyləyirdi asimanə.
Ki, o gecə olub əflak rövşən
Kəvakib intizam ilə müzəyyən
Olub rəxşan kəvakibi-şəmdani
Çerağan eyləmişdi asimani.
Səağabət pərto əfkən suye ba su
Füruzan cədiyü pərvinü tərazu.
Həzaran kokəbi-rəxşanü səyyar.
Fələk səthində olmuşdu pədidar.
Təmaşa qıldı Məcnun asimani,
Gəhi əxtərləri, gəh kahkəşani.
Sanıb hər kokəbi bir babi-hacət.
Kəvakibdən edib ümidi-nüsrət.

Gəhi bir kökəbi Nahid sandı,
Anı bəxşəndeyi-ümid sandı.
Anı dərdi-dilindən qıldı agah
Gəhi əraz edib, andan çəkib ah.
Dedi bir digərə kim, ey Zühəl sən
Kəramətdə, əsərdə bibədəlsən.
Kərəm qıl, üqdəyi-bəxtim güşat et,
Dili-naşadımı bir ləhzə şad et.
Gəhi bir digərin tutdu nəzərdə,
Anı qalib sanıb hər bir əsərdə
Güman etdi o kokəb Müştəridir,
Nücumun Əsədü valatəridir.
Xitab etdi dedi: «Ey əxtəri-Səd!
Kəşaişi-bəxşi aləmi sadiq vəd.
Edib idbarımı iqbal bir dəm,
Dilim qıl buyi-dildar ilə xürrəm.
Həmin minval ilə ru bər sitarə,
Çəkib kokəbləri bir-bir şümarə.
Edib hər kokəbi bir ad ilə yad.
Deyib dərdi-dərunin qıldı fəryad.
Nə miqdar ahü zar etdisə axir,
Nücumun olmadı bir sudi zahir.
Baxıb gördü kəvakib natəvandır,
Degil fərman rəva, fərman bər andır.
Kəvakibdən edib ərazi-yekbar,
Yəqin etdi ki, olmuşdur xətakar.
Təvəccöh qıldı dərgahi-xudayə
Niyazi-dəstini açdı duayə.
Niyaz etdi ki, ey fəyyazi-biçun,
Edənsən sən bəni Məcnuni-dilxun.
Sənin eşqində Məcnun olmuşam bən,
Sənin eşqində dilxun olmuşam bən.
Sənin eşqində nalanam şəbü puz,
Sənin eşqindənəm peyvəstə dər suz.
Təcəlləgahin oldu ruyi-Leyli,
Bəni qıldın əsiri-muyi-Leyli.
Həman pərto səbəbdir bu fəğanə,
Vəli Leylidir ancaq bir bəhanə.
Künun Leylidədir nurin firuzan.
Vəli bən atəşi-firqətdə suzan
Rüxi-Leyli ki, ol nurə səbəbdir,

Dili-zarim anınçün dər tələbdir.
İlahi, babi-lütfündür pənahim,
Sənə dilbəstəyəm, sənsən ilahim!
Kəvakibdir sənin yeksər qulamin,
Məqalidi-səmavü ərz namin.
Xudavənda, zəbunü xaksərəm,
Qəribü aşiqü naçarü zarəm.
Bəhəqqi abruyi əql əvvəl,
Ki, andən afərinişdir mükəmməl.
Bəhəqqi naleyi-dilsuzi-Yəqub,
Bəhəqqi dərdi-tənfərsayi-Əyyub.
Güşad et bəxtimə babi-fəlahi,
Mübarək qıl bənə, yarəb, səbahi!.
Bəni boylə pərişanhal qoyma,
Qəmi-hicrandə pamal qoyma.
Səbahın oldu çün asari peyda.
Nəsimində dəmi-İsa hüveyda.
Nümayan oldu sübh şadmani,
Bəsani-sübhi-əyami-cəvani.
Cəhani afitabi-aləməfruz,
Ziyapaş oldu, qıldı ruz piruz.
Qılıb Məcnun nişimən səng üzrə,
Edirdi nalə min ahəng üzrə.
Bəsani-didəbanan ruy bərrah,
Baxıb rahə edərdi ah, nagah.
Göründü çeşminə Zeydi-vəfadar –
Ki, sürətlə gəlir badi-səbavar.
Məşami dərk edib canani buyin,
Yetirdi asimanə hayü huyin.
Həman qalxıb rəvan oldu şitaban,
Sübaü vəhşiyan əqəbincə puyan.
İrişdi Zeydi istiqbal qıldı,
Gözün bus eylədi, xoşhal qıldı.
Dedi: «Səndə əyandır buyi-canan,
Dilü canım fədayi-muyi-canan.
Necədir zisti ol huri eynin.
Kimə qılmış həmayil zülfi-çinin.
Edərmi yad Məcnuni-zəbuni.
Sorurmu hiç bən bəxti-nikuni?
Sitayişxan olub Zeyd vəfakar,
Dedi: «Ey zümreyi-üşşaqə sərvər!

Həman Leyli ki, məhbubi-cəhandır,
Sənin eşqində daim xunfişandır.
Həman məhbub kim, Leylidi əknun,
Sənin eşqindədir ol daxi Məcnun.
O Leylinin ki, canbəxş idi ruyi,
Fədai-eşqin olmuş rəngü buyi.
Olub dərdü fəraqin natəvani,
Gülün, əfsurdə qılmış qəm-xəzani.
Üzari zərddir, əmma ki, zərdir,
Qəddi neydir, vəleykin
Sanadır meylü mehrü aşikara,
Hərasindən edər əmma müdəra.
Dilü canında daim fikri sənsən,
Zəbanində həmişə zikri sənsən.
Məni görgəc olub giryanü miyan.
Olub cuya sənin əmniyyətindən,
Məlalü möhnətü keyfiyyətindən.
Dedi: «Pamali-qəmdir gərçi Məcnun,
Bənim dərdimdir əmma ondan əfzun.
Ki, odur bir aşiqi-azadü çalak,
Vəli miskin bənəm kim, natəvanəm,
Xəyalimlə həmişə həmzəbanəm.
Bəsani-əndəlibi-pərbüridə
Qəfəsdə qalmışam möhnətrəsidə.
Rəqib əndişəsi, qürbət bəlasi,
Edibdir könlümü qəm mübtəlasi.
Bu iki dərddən nalanü zarəm,
Ki, naçarəm, zəlilü xaksarəm.
Nə dildə vardır cürət sitizə,
Nə payi-taqətim qılmış gorizə.
Bu qəmdən çün degil mümkün nicatim,
Qəvibünyad edib payi-səbatim.
Yaxıb atəşlərə canım nihani,
Fəda etsəm gərək canənə cani.
Vəli bu qəmdənəm peyvəstə dilxun
Ki, mənsiz necədir əhvali-Məcnun.
Çəkib alam ruzi-iştiyaqi,
Necə sübh eyləyir şami-fəraqi.
Kimə dərdin deyir, kimdir qərini,
Kim olmuş yarı, kimdir həmnişini?
Necə saziş qılır dövrülə dəhrin,

Necə bərduş edir əsqali qəhrin?
Necədir nari-qəmdə ruzgari,
Nə növilə keçir leylü nahari?»
Bu göftari ki, Leylidən eşitdim,
Cəvabın cavaca irad etdim.
Sənin əhvalını bibişü bikəm,
Yekayek eylədim təqrir bən həm.
Dedim: «Aşüftədir əhvali-məcnun,
Sənin eşqindədir zarü cigərxun.
Məkani guhi-dəşt, dəşti-vəhşət,
Məqami guşeyi-qəm, künci-möhnət.
Həmavazi, qərini vəhşiyandır,
Ənisi, həmdəmi dərrəndəqandır.
Bu dərd ilə, bu möhnətlə həmarə
Biyabangərd olub ol bəxti qarə.
Bəlayi-firqətdə təndadə ikən.
Qəmi-hicrandən üftadə ikən,
Vəfatı-validindən tazə bir niş,
Asıbdır sinəsində rişbərriş.
Künun ki, dərdi-firqətdən Natəvandır,
Gəhi matəmgüzarü novhəxandır
Neçə əşari-atəşnaki-qürra
Ki, etmişdin münasibi-hal inşa,
Həman əşardən bir neçə əfrad.
Dilimdə eyləmişdim, bən fəryad.
Sərayan oldum, etdi guş Leyli,
Düşüb torpağə, getdi huş Leyli.
Qalıb xak üzrə bir dəm mürdəasa,
Bulub axir üfaqət oldu muya.
Xitab etdi bənə giryanü rəncur.
Dedi: «Ey qasidi-üşşaqi-məhcur!
Nə dem kim, canibi-məcnuni-zarə
Gedər olsan, güzər qıl bəni-fikarə.
Ricadarəm, edib ümmid səndən,
Kərəm eylə, götür bir namə bəndən.
Bu gün ol məhvəşə getdim səlamə.
Gətirdim naməsin, həm iştə namə!»
Görüncə nameyi-Leylini Məcnun
Kəlami-şövqdən oldu digərgun.
Nişatdə gəhi rəqs etdi çalak,
Gəhi avazələr qıldı fərəhnak.

Olub bixud bu zövqi-bibədəldən
Qalıb namə əlində, getdi əldən.
Gəlib huşə, bulub aram bir dəm,
Güşad etdi səri-məktubu xürrəm.
Nümayan oldu xətti-canfəzasi,
İbarəti-bəliqü xoş ədasi.
İrişdikcə sənakari təmamə.
Bu məzmun ilə bəst olmuşdu namə-
Ki, bu bir nameyi-möhnətəsərdir,
Bir əhli-dərd halindən xəbərdir.
Anı təhrir edibdir bir diləfkar,
Əsiri-bənd, - yəni Leyliyə-zar.
Dili-aşüftə bir bixanimanə,
Kodur Məftunü Məcnuni-zəmanə.
Əla, ey aşiqi-gumgərdə canan,
Sənə cananın olsun canı qurban!
Əla ey aşiqi-möhnətrəsidə,
Sitəmdidə, qəmi-hicran kəşidə.
Əya, yari-əzizi-mehribanim!
Dilim asayişi arami-canim.
Mənə məftun olub, avarə oldun.
Mənə məşğuf olub biçarə oldun.
Gözün qani edib kuhi müləvvən,
Qılıbsan ləlvəş səng içrə məskən.
Əla ey zümreyi-üşşaqə səri-tac
Kəmandarani-həft ovrəngəamac.
Dili-zarin mənə təslim etdin,
Məni təhna qoyub səhrayə getdin.
Nədir halin bəlayi-firqət ilə,
Necə saziş qılırsan möhnət ilə?
Səni qılmış zəmanə dur bəndən,
Bənim bəxtim kimi məhcur bəndən.
Bu dərdə gərçi bən mübtəlayəm,
Sənin bəxtin kimi səndən cüdəyəm.
Vəli mənadəyəm həmdəm səninlə,
Tənimdə can olur xürrəm səninlə.
Ühudi dustidə bərqərarəm,
Həman peymanim üzrə paydarəm.
Həman gənci-gövhərdir qıfl bər dər,
Həman dürci-nəhandır möhr bər sər.
Bən ol gənci-nəhanə pasibanəm,

Tədaddən cəfadən dərəmanəm.
Əgər zahirdə vardır şuyi-Leyli,
Vəli Leylidə yoxdur şuyi-meyli –
Ki, könlümdür sənin eşqində məşğul,
Dilində səndən özgə cümlə məzul.
Qəmərlə, Şəmslə ruyin dəgişməm,
İki dünyayə bir muyin dəgişməm.
Budur peyvəstə amali-nihanim,
Ki, olaydın sən bənim həmaşiyanim.
Cəhandə olmasa vəslin müyəssər,
Qalır vəslət hədisi ta bəməhşər.
Edəndə əzm gurü dari-üqba –
Götürrəm mehrini canıla yekca.
Ki, qalxıb mehrinlə ruzi-məhşər,
Səninlə eylərəm eyş mükərrər.
Vüsalindən əgər zahirdə durəm,
Vəleykin bu ümidimlə səburəm,
Sənin halındanam agah, ey dost!
Ki, dərdindir sənin cangah, ey dost!
Vəfati-validin oldum şənidə,
Qəbayi-cismimi qıldım dəridə.
Urub əfsus ilə sərpəncə başə,
Vücudim qərq qıldım qanlı yaşə.
Bənim gər validim etsəydi rəhlət,
Bu rütbə tökməz idim əşki-həsrət.
Künun bu qürbəti-dəhşət fəzadən,
Bu matəmdən, bu pürğəm macəradən,
Dilim müstəğərqi-dəryayi-xundur,
Yüzüt sərpəncəm ilə niylügundur.
Bu matəmdə sənin tək biqərarəm,
Həmişə əşkibarəm, sukvarəm.
Qəddümim namüəssər olduğun sən,
Bilirsən, bir də nə təqrir edim bən.
Tənim hər necə səndən olsa məhcur,
Dilü canım vəli səndən degil dur.
Səbur ol, etmə qəm mərgi-pədərdən,
Degil bir sud hasil bu kədərdən.
Ki, qalmış sən kimi puri-girami,
Səninlə zindədir aləmdə nami.
Daxi bikəslikdən olma nalan,
Xudadır bikəsə yarü nigahban.

Tüəddayi-cəhandən olma muya,
Keçər hər necə olsa rəncü ruya.
Bu qəflətgəhdən birun olan dəm,
Olursan xəlvəti-vüslətdə xürrəm.
O xəlvətdə bulunmaz kinəcuyan,
Həmin bir sən olursan, bir də canan».
Qılıb Məcnunu xürrəm nameyi-yar,
Fərəhdən səcdəyə şükür səd bar
Olub bixud, alıb huşin məsərrət,
Qalıb, bir dəm, bulub axır ifaqət,
Gəhi bus etdi ol məktubu xürrəm,
Gəhi bus etdi Zeydin çeşmini həm.
Dedi: «Bilməm nədem, bidəstü payəm,
Bu vəhşətgəhdə bibərgü nəvayəm.
Nə kağaz vardır bundə, nə xamə
Ki, təhrir eyləyəm dildarə namə.
Qələm, kağaz çıxardıb Zeydi-çalak,
Edib təqdim Məcnun şəqəfnak.
Kitabət əmrini qıldı mühəyya
Götürdü xameyi-Məcnuni-şeyda.
Qəmi-dirinəsin təhrir qıldı,
Məhəbbət bəhsini təfsir qıldı.
Yazıldı namə, çün payanə yetdi.
Götürdü qasidə təslim etdi.
Rəvanə oldu Zeyd bərqrəftar,
Əlində nameyi-Məcnun naçar.
Şitaban eyləyib teyyi-mərahil,
Olub sərmənzili-məqsudə vasil.
Edib məktubunu təqdim Leyli,
Qılıb bus, eylədi təslim Leyli.
Alıb məktubu Leyli eylədi bus,
Basıb bağrına cantək qıldı məhrus,
Gəriban şəkibin çak qıldı,
Sirişki nameyi-nəmnak qıldı.
Güşad etdi sərməktubu axir,
Məali səbri-suzi oldu zahir
Ki, bu bir nameyi-atəşfəşandır,
Şərari-atəş suzi nəhandır.
Bəla pamali Məcnun cəhandən,
Ələm üftadəsi-bixanimandən
Sənə, ey sərvəri-xuban Leyli,

Ziyayi-bəzmi-məhbuban Leyli!
Edib suzi-dilim təqrir bir-bir,
Qılıb bu namədə təhrir bir-bir.
Dilimdə müştəiq vəqqaidi-narin,
Edib əlfazdə məzməri-şərarin.
Hüzurə eylədim irsal naçar
Ki, halimdən səni qılsın xəbərdar.
Əla, ey şəmi-bəzmi-xubruyi,
Güli-rənginü gülzari-nikiyi!
Olub nari-qəmin dildə firuzan,
Vücudim şəm tək olmuş güdazan.
Yaxıldım şəm tək leyl ələmdə,
Tənim məhv oldu nirani-sitəmdə.
Mənim halim budur, ey sərvi-dilcu,
Nə dersən, söylə halin, ey pəriru?.
Künun, əya, kim ilə həmzəbansən,
Kim ilə badəkeşsən, mehribansən?
Əla, ey dərdi-pünhanim təbibi,
Əla, ey cani-müştaqim həbibi!
Təddai-fəraqin möhnətindən,
Bəlayi-iştiyaqin şiddətindən,
Zəifəm, natəvanəm, müstəməndəm,
Kəməndi-firqətinlə payi-bəndəm.
Nəvanəm, dərdməndəm, xarü zarəm,
Pərişanəm, nəjəndəm, biqərarəm.
Dəvasi dərdimin səndə əyankən,
Ləbində çareyi-dərdim nəhankən,
Kimə izhar edim dərdi-dərunim?
Kim olsun çarəbəxşim, rəhnümunim?
Sənin bimarinəm, sən gəl əlac et!
Edib çarə, bəni xürrəmməzac et.
Əla, ey mahi-ruyin mayeyi-nur,
Rüxin zülmətzədəyi-şami-məhcur.
Bəni məktub ilə yad eyləmişsən,
Dili-məhzunimi şad eyləmişsən.
Qılıb hər bar izhari-iradət,
Edirsən dəvayi-eşqi-məhəbbət.
Bu dəvadə əgər sadiq dil isən,
Məhəbbətdə hərifi-kamil isən,
Gətir bürhanini göstər güvahin,
Gigərdağın, sirişkin, dudi-ahin.

Gər olsaydın bənə yari-müvafiq,
Olurdun etdigin dəvadə sadiq.
Bənim tək payimali-dərd olurdun,
Bənimlə sən də səhragərd olurdun.
Rəvamı bən qalım firqətdə muyan,
Ənimü əşkrizü Leyliguyan?
Sən əğyari-cəfakar ilə həmdəm,
Həmişə badəkeş, peyvəstə xürrəm.
Əgərçi rişteyi-əhdin mətindir,
Dəri-dürcun mətinü ahənindir.
Vəleykin zümreyi-üşşaqi-dilriş,
Olur fərti-məhəbbətdən bədəndiş.
Məgəs gəzsə yüzündə laubali,
Bənədir ol məqəs gərkəs misali.
Əla, ey mərhəmi-dağı-dərunim,
Əya, yəğmagəri-səbrü sükunim.
Qəmin sudi dili-bihasilimdir.
Qəmindən hasilim daği-dilimdir.
Bir möhnətgahdə bir yavərim yox,
Qəmindən qeyri-yari-digərim yox.
İrişsəydi sənə avazi-naləm,
Bilərdin kim, nə gunə xəstəhaləm –
Ki, sən guş etdigindən, bildigindən,
Künun aşüftəyəm, məcnuntərəm bən.
Qəmindən oylə bir əfsurdəhaləm,
Ki, guya zindeyi-meyit misaləm.
Xəbərdən gəh ki, buyin bulur dil,
Bulub buyinlə can, zində olur dil.
Pərişan eyləyib keysuyi-çinin –
Edən dəm şanə zülfi-ənbərinin,
Nəsim ilə qılıb bir buyi-əhda,
Bəni ol buyin ilə eylə əhya.
Nolaydı çərxi-kəcru ram olaydı,
Səninlə aşiqin həmcam olaydı.
Olaydın bəzmdə sən badə dər dəst,
Olaydım bən o cami-nuşdən məst.
Salaydım boynuma gəh zülfü-çinin,
Öpəydim gəh dəhənin, gəh cəbinin.
Ləbindən gəh meyi-cavid edib nuş,
Edəydim gəh səni cantək dərağuş
Nigara, bu məqalimdən fəsanə,

Qərəz kifayətdir, ancaq bəhanə
Ki, bu bir arzudur, qeyri-mövcud.
Məsəldir bu deyirlər:»Dər diləş bud».
Sənin eşqinlədir dil oylə məşğul,
Ki, fəth etməz sualın olsa məsul.
Həvayi-nabicayi qılmışam bənd,
Fəqət adınlayam eşqində xürsənd.
Nə dildir mail zünnarü Giysu.
Nə candır talibi-rüxsarü əbru.
Olub gər bəzmi-vəhdətdə qərinin,
Həzaran sal oursam həmnişinin,
Açıb didarına çeşmi-təməttə.
Cəmalin seyrini qılsam təvəqqə
Yaxar cismim şərari-qeyrəti-eşq,
Edər asarimi kəm setvəti-eşq.
Dilim kim, eşqin ilə həmnəfəsdir,
Dəxi meyli-səva bica həvəsdir.
Sənin eşqinlədir çün karü barim,
Bənim surətlə bir daxi nə karim?
Əgərçi dərdi-eşqin bidəvadır.
Bəlayi-firqətin möhnətfəzadır.
Vəleykin olduğunda sən səlamət,
Bənə bu dərddən yoxdur nədamət.
Səlamət ol, həmişə şadman ol,
Cəhan olduqca olda kamran ol!
Fələk fərmanbəri-iqbalin olsun,
Qəfayi-bəddilan pamalin olsun.
Zəhi dövlət ki, Nakam, aşiqi-zar
Budur firqətdə nagah buyi-didar,
Qılır bir dəm ümid avazəsin guş,
Edər ənduhi-hicrani fəramuş.

### MƏCNUNUN XALUYİ-PİRİ SƏLİM AMİRİ ƏYADƏTİ-MƏCNUNƏ GETDİGİ VƏ BİR VƏHŞƏTGA DƏ MƏCNUNU ZİYARƏT ETDİGİ VƏ NADƏRİ-MƏCNUNUN MƏCNUNƏ MÜLAĞİ OLDUĞU VƏ MÜRACİƏT BƏDİNDƏ VƏFAT BULDUĞU

Dəbiri-kamili-həngaməpərdaz
Edibdir boylə bu həngaməyi saz-
Ki, Məcnunu-zəbunin xali-piri

Olub qəm düşkünü, möhnət əsiri.
Anı naçar edib əhvali-Məcnun,
Qalıb möhnətdə olmuşdu cigərxun.
Əgər nami Səlimi Amiridi,
Vəli tədbirdə bir samiridi.
Hərifiydi zəmani-biəmanin,
Nədimiydi güruhi-aşiqanin.
Cəhanın zəhr alamin çeşidə,
Həzaran dərd didə qəm kəşidə.
Olub həm xastə, həm üftadə,
Kəbab olmuşdu həm siyxi-bəladə.
Qəmi-Məcnun ilə ol piri-dilxun
Gəzib səhraləri həmun bə hamun,
Təfəqqüd eyləyərkən iztirari,
Bəla fərsudəsi Məcnuni-zari.
Eşitdi bir tərəfdən nabi-yusan
Müəssər bir təhəmmül suzi-əfqan.
Edib ətf nagəh gördü ki, Məcnun
Həman əfqan edər məhzun-məhzun.
Nişiməngahidir bir guşeyi-təng.
Fəraşi xarü xas, balinidir səng.
Dutadır dərddən şaxi-nihali,
Vücudi zəfdəndir mu misali.
Nigahbanıdır ətrafında hər an,
Pələngi-tizi-cəngü şirü cərran.
Hərasi şirdən çıxdı kənarə,
Əda etdi səlamın ba işarə.
Görüb Məcnun işarəti səlamin,
Dedi: «Kimsən, nədir ey dost, namin?»
Xitab etdi həman piri-müşəvvəli,
Dedi: «Ey aşiqi-zari-bəlakəş!
Sənin xali siyəhruzin Səliməm-
Ki, dərdinlə cigərxunəm, səqiməm.
Çü bildi halini Məcnuni-heyran,
Gətirdi əndişə, oldu sənaxan.
Edib yekrəng xalusilə halın,
Təfəhhüs qıldı sordu hali-xalin.
Səlimi Amiri gördü ki, Məcnun
Bürühnətən qalıb olmuş digərgun.
Ki, guya gor içində bir bədəndir.
Vəli bu gurgahdə bikəfəndir.

Rəvan bir camə verdi guşiş ilə.
Dedi: «puş et tənin bu puşiş ilə».
Gəlib güftarə Məcnuni-pərişan
Dedi: «Ey çarəbəxşi dərdməndan!
«Tənim ur olduğundan olma qəmnak,
Budur əndişeyi-üşşaqi-çalak.
Bəni məzur tut bu macəradən
Ki, bən varəstəyəm çünü çaradən.
Bu vadidə tənim ta ur olubdur,
Təəllüq damənimdən dur olubdur.
Hesab et, bu libasi dər bərə etdim,
Genə qaldım onu sədparə etdim.
Vücudimdir bənim bir atəşi-tiz
Həmin kərbaslardır pənbəamiz.
Həzaran bar olunmuş azmayiş
Ki, pənbə bulmamış atəşlə saziş.
Nə dürlü üzarlər qıldısa zahir,
Kifayət etməyib əzari axir.
Səlimi guşəşindən oldu məstər,
Həman əsvabi Məcnun qıldı dərbər.
Səbuk qalxıb Səlimi nazikəndiş,
Gətirdi nanü büryan həddindən biş.
Nə rütbə yalvarıb etdisə nalə
Ki, Məcnun əkl qılsan bir nəvalə.
Vəli Məcnun keçib zövqi cəhandən,
Fənavül etmədi bir loğmə andən.
Gəhi büryan alırdı, gah nani,
Edirdi sir anınlə vəhşiyani.
Səlim axır dedi: «Ey dərdə mötad!
Bulur qult ilə qüvvət, adamizad.
Künun bu qüvvətdən kim, bahəzərsən,
Nədir qultun sənin, sən gər bəşərsən?
Dedi Məcnun ki, ey xali-xirədmənd!
Dəhani xahişi bən etmişəm bənd.
Tənim ol payədə olmuş füsurdə
Ki, olmuş xahişim nirusi mürdə.
Bənim qutum əgər qut istəsəm bən,
Olur hasil nəsimi-sübhdəmdən.
Bənə hər dəm nəsimi-kuyi-dilbər
Edər amadə quti-ruhpərvər.
Bənim quti-dilimdir buyi-canan,

Bulur cananə buyindən tənim can.
Bəşərlik hali etdikdə təqaza,
Anı dəf etməgimdir səhl zira.
Bənimçün ol qida kəm müştəhadır,
Həman ya səmğ, ya bərgi-kiyadır.
Bu həm vaqe olur bərgəz, bəhər mah,
O da nə bərmurad nəfsi-gümrah.
Əlaqəm çün kəsilmişdir xuruşdan
Əminəm ehtiyaci-pərvərişdən.
Edib bərgi-dirəxtanə qənaət,
Cəhandə bulmuşam künci-qənaət.
Səlim etdi yəqin kim, ol girami,
Kiyahə dəgişirib cümlə təami.
Bəqa zövqün bulub, keçmiş fənadən,
Dəxi müstəğni olmuşdur səvadən.
Səna qıldı dedi: «Ey gövhəri-pak!
Səzadır cilvəgahin olsa əflak.
Ki, hər kəs qane bəagi-kiyadır,
İki aləmdə bişək padşadır.
Cəhanda kim ki, qılsa meyl danə,
Anı zərdam edər axər zəmanə.
Zəlilü əsfəlü məşum eylər,
Hərumi-qürbdən məhrum eylər.
Bəsa mürğ həmapərvazi-xudkam –
Ki, olmuş təməü neçün tömeyi-dam»,
Bu qöveü guş edib Məcnuni-fazil,
Süruri binəhayət qıldı hasil.
Təfəqqüt eylədi keçmiş zəmani,
Təfəhhüs qıldı bir-bir dustani.
Edib xunbar nagəh gözlərini,
Gəlib fəryadə, sordu madərini.
Dedi: «Hali nədir ol binəvanın
Ənisi kimdir ol bəxti qəranın?.
Zəbundurmu o mürği-pərşikəstə,
Digərgundurmu ol biçarə xəstə?
Anın həqqində bəski rusiyahəm,
Digərgunəm, kənun hali təbahəm.
Yaqıb canım şərari-iştiyaqi,
Keçibdir həddi dərdi-iftiraqi.
Cəmalin görməyə çox şövqməndəm,
Nədim, əmma nəzarəm, ziri-bəndəm».

Eşitdi xali-piri bu məqali,
Olub əsrarə vaqif, bildi hali.
Ki, Məcnunun qali-göftugusi,
Dilində iştiyaqü arizusi,
Cəmali-madərin görməkdir ancaq,
Yüzün iqdaminə sürməkdir ancaq,
Rəvani övdətqılıb açdı pərü bal,
Gətirdi madəri-Məcnuni filhal.
Çü gördü madəri Məcnuni-zari,
Baxıb Məcnunə çeşmi-əşkbari,
Qəddi gördü xəm olmuşdur ələmdən,
Vücudi zəf bulmuşdur sitəmdən.
Vücudin məhv edib dərdi-nəhani
Vücudindən qalıbdır üstüxani.
Bəhar səhhəti pəjmurdə olmuş,
Güli-sorxi solub əfsürdə olmuş.
Çəkib ağuşinə Məcnuni axir,
Qılıb payansız iltaf zahir,
Edib gəh şanə zülfi-tabdarin,
Gəhi pak etdi rüxsari-qubarin.
Gəhi bus etdi ruyin , gəhi cəbinin,
Gəhi bus etdi çeşmi-dərdi-binin.
Fəğanlər eyləyib giryanü giryan,
Təzərrülər qılıb nalanü nalan.
Dedi: «Ey cani-madər, gəl kərəm qıl,
Bu gurbətdən keçib, tərki-ələm qıl!
Yetər bu rütbə nasəncidə möhnət,
Yetər zillət, yetər ənduhü həsrət!
Xamuş eylə, bu narü-cangüdazi,
Yetər, bəsdir bu miqdar eşqbazi.
Bu vəhşətgahi qılma aşiyanə,
Gəl, ey puri-əzizim, xanimanə!
Bənə bir dəm vəfa qıl, mehriban ol!
Bənimlə həmcəlis ol, həmzəban ol!
Qəza qətlimə çəkmiş tiği-tizi.
Əcəl sədd eyləmiş rahi-gürizi.
Cəhandən validin getdi mükəddər,
Bənim həm getməyim olmuş müqərrər.
Olub bir ləhzə dildarinlə xürrəm,
Görüm rüxsarini can verdiyim dəm.
Bəni dəfn et, genə tərki-diyar et,

Gəlib bu kuhsari ixtiyar et».
Alıb bir dəstinə kiysusini həm,
Digər dəsti tutub Məcnuni möhkəm.
Qılıb bir-bir bu təqriratı irad,
Axıtdı əşki-çeşmin, etdi fəryad.
Eşitdi çünki Məcnun bu xitabı
Füzun oldu dilində iztirabı.
Rizasın almaq üçün madərinin,
Qədumi təhtinə qoydu cəbinin.
Dedi: «Ey madəri-müşfiq, səbur ol!
Qəzadən şikvəgu olma, şükur ol!
Bu eşqi-huşfərsayiü bu xari,
Bilirsən kim, degildir ixtiyari.
Bən hər divaneyi qomgərdə rahəm,
Vəli bu keşməkeşdə bigünahəm.
Zühur etdikdə asari-sərriştim,
Bu olmuşdur qəzadən sərnəviştim.
Qəza böylə bəni sərgəştə qılmış,
Qədər iqbalimi bərgəştə qılmış.
Anı kim eylimiş Nakam təqdir,
Anı bakam edərmi hiç tədbir?
Bəni bu halimə tərk eylə, naçar,
Əlaci-dərdimə səy etmə, zinhar!
Əsamü rusiyahəm, hümmət eylə!
Qüsurimdən güzər qıl, ovdət eylə».
Düşüb Məcnun qədumi-madərinə,
Sürüb xaki-qədumin gözlərinə
Kəfi-payin öpüb bir də mükərrər,
Rəvan oldu dəvan, aqibincə ləşkər.
Həman piri-zən qomgəştə fərzənd,
Pərişanü nəjəndü nabərümənd.
Edib əqəbincə Məcnunun nəzarə
Təhəssür birlə baxdı kuhi-sarə.
Qılıb naçar ovdət dağ bir dil
Edib teyy məkan mənzilbəmənzil.
İrişdi mənzilə xatirşikəstə
Dəruni-möhnətdən oldu xəstə.
Qalıb bir neçə gün rəncur möhnət,
İrişdi aqibət hingami-rəhlət.
Verib fərzəndinin dərdilə canın,
Rəhayab oldu dərdindən cəhanın.

Əya, dərvişü durəndişi-aqil,
Cəhanin cilvəsindən olma qafil!
Ki, mərdomxarlıq əndişəsidir,
Zəbunkoşlik həmişə pişəsidir.
Könül vermə, cəhani-bivəfayə,
Yaxılma bihudə nari-cəfayə.
Nə bəxş eylərsə bu dəhri-cəfakar,
Alır bir-bir anı, bir də digər bar.
Bu əvvəlkidir ki, əqli pişva qıl,
Olub peyru ona, tərki-səva qıl!
Ələm çək laməkanə, xakdən keç,
Güzər qıl ərşdən əflakdən keç!
Nə türfə söyləmiş piri-girami,
Vəlilər sərvəri-yəni Nizami:
«Be payi-can təvani şod bər əflak,
Rəha kon, şəhrbənd xak bər xak.
Məgu bər bami gərdun çün təvan rəft,
Təvan rəft ər ze xod birun təvan rəft.
Bi pors əz əqlo durəndişe küstax
Ke çün şayəd şodən bər bani ik kax.
Xərəde şeyxol şiyux rah bus
Əz u pors ançe minorsi nə əz kəs».
İrərsə mənzilə salik bəhər hal
Sülukində əgər etməzsə ehmal,
Keçər bəndərləri fərsəngü fərsəng,
Əgər olmaz isə payi-xird ləng.
Yetər, Nakam, bu qəflət, bu məsti,
Yetər, insaf qıl, bu xudpərəsti.
Cəhanin karini tərk et cəhanə,
Ovc et ruhmanənd asimanə.

## MƏCNUNUN VƏFATİ-MADƏRİNDƏN XƏBƏRDAR OLDUĞU, ZİYARƏTİ-TÜRBƏSİNƏ ƏZİMƏT QILIB FEYZ BULDUĞU

Fələk bir gün edib bərhəm sükunin,
Edib peyda səhabi-nilgunin.
Cəhani eyləmişdi təngü taran,
Bəsani-xatiri-matəmgüzəran.
Əsib şiddətlə badi-əbri gərdan,
Sıxıb əbri-siyahi bərqi-rəxşan.

Pəyapey rəd edib heybətlə nalə,
Səhab olmuşdu əşkəfşan bu halə.
Biyaban içrə Məcnun rəmidə
Qılıb inşa qəsidə bər qəsidə.
Nə agah gərdişin bazilərindən,
Nə vaqif irtihal madərindən.
Olub vəcd ilə hər ləhzə sərayan,
Qılırkən yad edib Leylini əfğan.
Səlim Amiri oldu pədidar,
Əyadət qıldı Məcnuni digərbar.
Bəqasində müsibət macərasi,
Bərduşində həm matəm libasi.
Görüb Məcnuni oldu zarü giryan,
Pərişanü mükəddər, növhəguyan.
Dedi: «Ey eşqdən sərgəştə Məcnun!
Dəmi-matəmdir əfğan eylə əknun
Ki, Babək tək olub əfsurdəyi-qəm,
Cəhandən rəhmət etdi madərin həm.
Necə kim, Babək oldu nabərümənd,
Kənun mamun da getdi arzumənd.
Bu peyğami ki, Məcnun guş qıldı,
Dərunində yəmü qəm cuş qıldı.
Qılıb ah ilə əflaki mükəddər,
Rəvan oldu bəsani-badi-sərsər.
İrişdi türbəgahə, qıldı fəryad,
Gah etdi validin, gah etdi madərin yad.
Edib xunpaş çeşmi-əşkbarin,
Dərağuş eylədi mami məzarin.
Hər iki türbət üzrə oldu puya,
Hər iki mərcdə oldu cəbinsa,
Cəhani tutdu əfğani, sədasi,
Fəğanin guş qıldı əqrəbasi.
Gəlib gördülər əhvalı yamandır,
Nəzarü məstiməndi, natəvandır.
Niyaz etdilər, oldular ricadar –
Ki, etsinlər anı kəndilərə yar.
Nə gunə etdilərsə mehr zahir,
Sirayət etmədi Məcnunə axir.
Həman dəm tərk qıldı ol güruhi,
Edib fəryad tutdu rahi-kuhi.
Əzimət qıldı, getdi ru behəmun,

Dili pürcəm, gözü pür ğəm, cigər xun.
Gəzib əqbincə vəhşilər qatari,
Gəhi səhraləri, gəhi kuhsari.
Cəhan əhlindən etdi qəti-peyvənd,
Təcərrüd aləmində oldu xursənd.
Cəhanin çəşni surun hayü huyin,
Gülüstanin, bəharin, rəngü, buyin,
Dəgişdi bəzmi-rəncə, dərdi-eşqə,
Gülüstani bəlayə, vərdi eşqə.
Əgərçi zahirən divanə oldu,
Vəli mənadə bir fərzanə oldu.
Budur, Nakam, kirdari cəhanın,
Həmi bərəksdir kari cəhanın.
Ki, mərdi-aqilə divanə deyirlər,
Vəli divanəyə fərzanə deyirlər.

## LEYLİNİN ARZUMƏND DİDAR OLUB MƏCNUNU TƏLƏB QILDIĞI VƏ MƏCNUNUN VƏSATƏT ZEYD İLƏ BİR SƏBZƏZARDƏ LEYLİNİ BULDUĞU

Gözəllər şahi, əsrin nazənini
Behişti həşəmət bağının huri-eyni.
Hilali-əbruyü məhruyü səmənbər,
Qəddi sərvi-rəvan, zülfi müənbər,
Büti-pərdənişini çsin hüsnün,
Mücəssəmi ruhi elleyn hüsnün
Məhəbbət məzhəri yəni ki, Leyli,
Bulub şiddət dilində eşq meyli.
Fəraqi-yardən zarü diləfkar,
Həzarən dərdi-pünhanə giriftar.
Əsiri-zar olub, olmuşdu məhbus,
Həmişə təngdil, peyvəstə məyus.
Nə var idi fərarə ixtiyari,
Nə qalmışdı qərarə iqtidari.
Degildi bənddə, bənd bər pa,
Vəli bibənd idi dər bənd zira.
Ki, dəsti-şuy vardı damənində,
Olurdu daima pirams nində.
Edib şuyi əgərçi canfəşanlıq
Həmişə eyləyirdi mehribanlıq.
Vəli dilsərd idi Leyli anınlə,

Degildi yekcəhət meyli anınlə.
Qəzarə, Leyliyi-fərxundəsirət.
Rəqibindən bulub bir gecə fürsət.
Hərəmindən çıxıb şəhrahə çalak
Dili dildarilə məşğuli bibak.
Edərkən cüstcu bir mərdi-hüşyar,
Ki olsun yari halindən xəbərdar.
Pədidar oldu nagəh Zeydi-şəbgərd
Təsadüf eylədi həmdərdə həmdərd.
Dedi Leyli ki, ey Zeydi-vəfadar!
Necədir hali-Məcnuni-diləfkar.
Onun halindən olmuşsanmı agah?
Kimin eşqi qəmindən eyləyir ah.
Kimin mehrinədir dildadə əknun?
Kimin dərdilədir hali digərgun?
Dəhanın açdı Zeyd oldu sənaxan
Dedi: «Ey şəmi-bəzməfruzi-xuban!
Həman Yusif səninlə mehribandır,
Sənin cahi-fəraqində natəvandır.
Həmarə gəşt edib vadibəvadi
Səni cuyindədir, sənsən muradi
Bədnikü cəhandən bixəbərdir,
Şərabi-eşqin ilə gərmsərdir.
Degildir fikrü zikri hərfi digər,
Lisanində həmin Leylidir əzbər.
Çü Leyli oldu vaqif, bildi hali,
Fəğanlar eylədi qoqnos misali.
Tökübüb xunabə çeşmindən o məhvəş,
Dedi: «Məndən olub peyda bu atəş.
Yaxıb Məcnuni bisaman edibdir,
Bənim həm bağrımı büryan edibdir.
Biz iki aşiqiz yekdərd əlhəqq,
Budur mabeynimizdə fərqi-mütləq.
Gəh ol hərdəm edər kuh üzrə şivən,
Vəli çah içrəyəm fəryadzən bən.
Kərəm qıl, durma, ey peyki-giramim,
Bulub Məcnuni təbliğ et səlamim!
Gətir ol aşiqi-bixanimani,
İqamətgahin eylə gülüstani.
Bəni andə gəlib eylə xəbərdar,
Gəlib bən həm edim seyri-rüxiyar

Təmaşa eyləyim rüxsari-alin,
Bilib halin, sorum dərdi-məlalin.
Görüm kim, necədir rahi-bəladə,
Sübat üzrəmidir şərti-vəfadə.
Olur ki, bir neçə tazə qəsidə,
Sərayan olsun ol möhnətrəsidə.
Kəlami-ruhbəxşin eyləyib guş,
Edim alami-hicrani fəramuş.
Rəvanə oldu Zeydi-paksurət,
Cünun səhrasinə qıldı əzimət.
Gəzib vadibəvadi hər məkani,
Bulub Məcnuni axir nagəhani,
Düşübdür gördü bir vadidə qəmnak,
Pərişanü mükəddərruy bərxak.
Pələngü şir olublar pasibani,
Edirlər hifz ol gənci-rəvani.
Çü Zeyd xəndəruyi gördü Məcnun,
Hüzurə bar verdi qıldı məzun.
Edib Zeyd aqibət göftarə acaz,
Sənaxan oldu sonra etdi avaz.
Ki, ey daim səninlə eşqi-qaim,
Səninlə qaim olsun eşqi-daim.
Fiyuzi-eşqin olsun cavidani,
Həmişə müstəviz et aşiqani,
Təzərvi-bağı-hüsni-nazi-Leyli
Xuraman sərvi-sərəfrazi-Leyli.
O Leyli kim, onun Məcnunisən sən,
O Leyli kim, onun məftunisən sən.
Olub zikri həmin Məcnunü Məcnun,
Dönüb aşüftə bir Məcnunə əknun.
Digərgun eyləyib halin xəyalin,
Olubdur arzuməndi-vüsalin
Məqami-vüslətin ol mahi-ənvər,
Edib bir türfə gülşəndə müqərrər.
Sənə mehrin pədidar eyləyibdir,
Səni təklifi-didar eyləyibdir.
Ki, seyr etsin cəmalin, xürrəm olsun,
Səninlə bir-iki dəm həmdəm olsun.
Edibsən dəmbədəm Davudi-əlhan,
Bəsani-bülbül olduqca qəzəlxan,
Eşitsin nəğməni, yetsin muradə,

Güli-xəndan olub olsun kəşadə.
Olursan sən də məsti-zövqü didar,
Edərsən dəmbədəm seyri-rüxi-yar.
Cəmali röyət ilə şad olursan,
Qəmi-hicrandən azad olursan,
Verib ol rahi reyhan sən edib nuş,
Sən eylərsən tərənnüm, ol edərguş.
Verər əndazə Leyli tazə nazə,
Olursan sən qəzəlxan tazə-tazə.
Verib bir dəsti sövb Xosrovani
Ki, Leyli ərməğan etmişdi ani.
Dedi kim, bu libasi dər bər eylə,
Həmin dəm əzmi-kuyi-dilbər eylə.
Dəxi etmə təvəqqüf kim, o məhvəş
Qalıbdır intizarində dər atəş.
Olub dilşad Məcnuni-fitadə,
Rəvan oldu rəvan Turi-mürадə.
Həman Zeydə edib təbəiyyət andə,
Müxalif kəşməkəşdən varəhandə.
Olub muştaq abi-zidəgani
Ki, guya Xizrin olmuş peyrəvani.
Pəyapey Zeyd ilə getdi şitaban,
Gəhi şadi künan, gahi sərayan.
Səbaü vəhşiyan əqəbincə həmrah,
Bəsani-ləşkəri-canbaz başah.
Bu tərz ilə dilində şövqi-didar,
İrişdi vədəgahə axərkar.
Ki, ol bir bağ idi firdovsasa,
Həvasi dilguşa, səhni dilara.
Deraxtani süpehrə sərgəştə,
Qəzalan sayəsində arəmidə.
Nəvayi-bülülü avayi-dürrac,
Edərdi xanimani-səbri tərac.
Sərapa dilkəş idi səbzəgahi,
Rəyahin idi sər ta sər kiyahi.
Nəsimi ənbərəfşan müşkpərdaz
Nişat idi nəsimi birlə dəmsaz.
Nəşiməngah üçün Məcnuni-şeyda,
Edib bir guşeyi-canbəxş peyda.
Bulub sövdagəran sərmayəsində,
Oturdu bir sənubər sayəsində.

Gedib Zeydü vəfadarü nikukar,
Edib Leylini halətdən xəbərdar.
Dedi: «Məcnun gəlibdir vədəgahə».
Baxıb həsrət gözülə şahrahə.
Eşitdi bu pəyami ol pərizad,
Pərivar eylədi pərvaz dilşad.
Gəlib Məcnunə qarşı bir məqamə,
Ki, olurdu bədi ondan həngamə.
Tutub aram andə çarü naçar,
Gedib arami, qaldı zarü naçar.
Dedi: «Ey Zeyd, yoxdur daxi tabim,
Dili-zarimdə çoxdur iztirabim.
Olub şövqüm həvasi atəşəngiz,
Bu nari-şövqi kim, bən etmişəm tiz.
Əgər bir xütbədə keçsəm ziyadə,
Yanar canü tənim nari-bəladə –
Ki, bir ad isə də şövhərdəyəm bən,
Bu əhvalım degil pünhan xudadən.
Əgərçi şuydən bizarü zarəm,
Vəli nə öylə şux zeştkarəm.
Dəxi bundan keçərsəm narəvadır,
Təriqi-eşqdə eyni-xətadır
Hürufi-töhmətavərdən sərasər,
Bu öylədir ki, olsun pak doxtər –
Ki, fərda olmayım xarü siyəhru,
Qərəzsə bu qədər bəsdir, yetər bu.
Künun ol aşiq olsun nəğməpərdaz,
Sürudilə bəni qılsın sərəfraz.
Qəzəlxan olsun o, bən eyləyim guş,
O versin cami-mey, bən eyləyim nuş».
Gülün peyğamini Zeyd səba dəm –
Gətirdi bülbüli-şeydayə xürrəm.
Düşübdür gördü bixud xakə bülbül,
Anı mədhuş edibdir nikhəti gül.
Həman əfsus edib giryan oldu.
Sirişkilə gülabəfşan oldu.
İfaqət buldu Məcnuni-cigərxun,
Oturdu Zeyd ilə məsrurü məmnun.
Dedi kim: «Bu nə xoşbudur ki, guya,
Olubdur nafeyi-mişkin buya.
Degil bu buy buyi növbaharin,

Bu budur buyi-keysusi-yarin.
Bu bu peyvəstədir keysuyi-yarə
Olum qurban bu buyi-müşkbarə!
Toxunmuşdur bu bu ol tari-muyə,
Fəda olsun dilü canim bu buyə!».
Edib ol aşiqi Zeyd azmayiş,
Bu məzmun verdi güftarə güşayiş:
Ki, etmə zənn kim, gəlmiş nigarin,
Zəmani gəlməmiş açmış baharin.
Budur dildar ki, nadidə halin,
Nolar halin, əgər görsən cəmalin?
Dedi Məcnun ki: «Ey pakizə gövhər!
Bu nazik bəhsdən bəhs açma digər.
Çü bən buyi-gül ilə olmuşam məst,
Degildir mümkün olmaq badə dər dəst».
Edib bülbülsifət avazə ağaz,
Bu əbyat ilə oldu nəğməpərdaz:
«Əla, ey qönçeyi-rənginü xəndan!
Həzar zarin olmuşdur pərişan.
Əcəbdir kim, həzar etdikdə fəryad,
Olur gül qönçəsi xəndanü dilşad.
Şəbənruz eyləyir fəryad bülbül,
Dəriğa, həmnişini xar olur gül!
Bu bəhsi-mübhəmi təfsir edirsəm,
Gərək sirri-təəşşüqdən edəm dəm.
Vəli bu sirri pünhan eyləmişlər,
Edənlər nəql mücməl söyləmişlər.
Əya, mehri-süpehri-xubruyi
Cəmalin mahi-gərdun nikuyi.
Ümidi naümidan fəraqin,
Təvani natəvanan iştiyaqin.
Ədibi-qabili əsrari-eşqin,
Təbibi-kamili bimari-eşqin.
Cəhanın canı canani-cəhansən,
Mücəssəm ruhsən ruhi-rəvansən.
Bənim halimi bilməksə məramin,
Fədayi-eşqinəm, ey bən qulamin.
Bəla birlə bənəm peyvəstə xürrəm,
Bən zar ilədir xürrəm bəla həm.
Müqəvvavar bidil bərtənəm bən,
Tənimdə dil də sənsən, can da sənsən.

Sənin budinlədir asari-budim,
Sənin eşqinlədir qaim vücudim.
Tənim olduqda hicrindən xəlǝlyab,
Həman kuyin nəsimindən bulur tab.
O badi-xoş ki, kuyindən vəzandır,
Zədayi-qəm səfabəxşi-rəvandır.
Əla, ey məhvəşim, arami-canim!
Baxıb əhvalimə guş et fəğanim.
Rəqibin eyləyib royət fəsadin,
Hərasindən rəqibi bədnəhadin.
Sənin kuyində munis olmuşam bən,
Fiyuzi-cavidani bulmuşam bən.
Sənin sükbaininəm, dildir məkanin,
Bu dərdlərdir sükani-astanin.
Gülün zovqilə bülbül dər əfğandır.
Vəli hicranında Məcnun natəvandır.
Şivazi-vəslə pərvanə yaxır can,
Vəli Məcnundur firqətlə suzan.
Olurmu, yarəb, ol fərruxəsərdəm,
Olaydım işrəti-vəslinlə xürrəm.
Şəbi-məhtab həmçün ruz rövşən,
Fəzayi-gülüstan tənha sənü bən
Olub əğyardən ol bəzm xali,
Kəşakəndən olaydım laubali.
Qəmi-dirinəmi təfsir edəydim,
Sənə dərdü dilim təqrir edəydim.
Sənü bən künci-vəhdət, bəzmi-xəlvət,
Miyançı rahi-reyhan, cami-işrət.
Verəydin sən qədəh, bən nuş edəydim,
Səni sərməst dərağuş edəydim.
Salıb gəh boynuma keysuyi-çinin,
Gəhi bus eyləyəydim məhi-cəbinin.
Edib zülfi-xəmin gəh dəstə-dəstə
Edəydim sünbüli dər həm şikəstə.
Tutaydım gah sibin, gah narin,
Olaydım bəhrəmǝndi bu bəharin.
Gəhi bir dəm olaydım sibsayin,
Olaydım gahü gəh həm narxayin.
Edəydim bən ləbinlə bysəbazi,
Edəydim sən də gahi sazi nazi
Niyaz etdikcə bən sən naz edəydin,

Genə mehr etməyi ağaz edəydin.
Edəydim tazədən ağazi-busə,
Tutaydı aləmi avazi-busə.
Edəydim gahi zülfün tabü dər tab,
İçəydim gah ləbindən abi-ənnab.
Mənə bir böylə ruzi-behcətəfza.
Nəsib et, yarəb, ol məhvəşlə yekca.
Görüb əbrulərin, ey məhi-taban!
Dil oldu müztərib, halim pərişan.
Olur, əlbəttə, əhvali-digərgun
Görəndə mah növ biçarə Məcnun.
Künun fərq etməyə yoxdur təvanim,
Nəyəm bən, ya nəçündür bu fəğanim?
Sənin qürbünmidir bu ya bəxabəm,
Bəsani-təşnə, ya əndər sərabəm.
Fəraqindən yaxılmışam sərapa,
Vüsalin arzuməndidim, əmma.
Gəlib də bulmadın bir ləhzə aram,
Edərsən əzmi-ricət, ey güləndam!
Bu nə baziçədir peyda edərsən,
Bəna naqisligim ima edərsən?
Bəli, bən irmədim hala kəmalə,
Degil canım bənim qabil vüsalə.
Bu xaki tirədir ta dər miyanə
Kənar olmaz aradən bir bəhanə.
Hicabi vəslin olmuş tən iradə
İrişməz bu tən ilə can muradə.
Gərəkdir tərk edim bu xaki xakə
Ki, vəsl olsun müyəssər cani pakə».
Bu əşari qılıb irad Məcnun.
Edib fəryad, getdi ru bəhəmun.
Edib Leyli dəxi bir ah getdi,
Məqamin guşeyi-qəmxanə etdi.
Olursə eşq əgər xali-həvadən,
Keçər aşiq həvayi-masivadən.
Kimə, Nakam, yar olsa bu dövlət,
Ona məkşuf olur sirri-həqiqət.
Təməvvüc etsə bəhri-cəzbeyi-həqq
Edər hər qətrəyi bir bəhr mütləq.
İlahi, aşiqin Nakami-zarə
Qılıb tövfiqini rəhbər himarə –

Anı peymanə peyman ələst et,
Meyi-xumxaneyi-qeyb ilə məst et!

### İBN SƏLAMIN TƏRKİ-HƏYAT QILIB TƏNGİNAYİ-FƏNADƏN AZAD OLDUĞU VƏ LEYLİNİN ƏLAYİQ ŞUYİNDƏN NİCAT BULUB ALAMİ-HİCRAN MƏCNUNDƏN FƏRYAD QILDIĞI

Dəmadəm dövri-digərguni-dövran
Edər bir rəngi digərgun nümayan.
Birin pabənd edər qeydi-bəladə,
Birin xorsənd edər bəzmi-səfadə.
Qılır bir fövci-cami-işrət,
Edər bir fövci pamali-məzəllət.
Həzaran nəqş edər peyda bəhri-an
Ki, hər nəqşi qılır idrakı heyran.
Edər gahi gülü həmxaneyi-xar,
Gəhi gənci qılır kaşaneyi-mar.
Edər gəh Yusifi məscunü məhzun,
Qılır gahi Züleyxani digərgun.
Biri qılmaqda daim bürumənd,
Birin etməkdədir möhnətdə pabənd.
Qərəz, dövrani-dunun gərdişindən,
Süpehri-vajgunun gərdişindən,
Büti-bütxanəyi mülki-həqiqət,
Ərusi-hicleyi-əsrari-vəhdət.
Hədisi-eşqdən məqsudi-məni
Məhəbbət bəhsinin məfhumi, yəni –
Füruği nuri-Turi-hüsni-Leyli
Sərapa eyni-nur hüsni-Leyli.
Əgərçi mah idi hüsnü bəhadə
Vəli qalmışdı kami əjdəhadə.
Cəmali Afitabi behcət idi,
Giriftari-küsuri-möhnət idi.
Yanırdı cani nari-həsrət ilə,
Günü daim keçirdi möhnət ilə.
Olub şuyi həmişə pasibani,
Tuturdu mərdom çeşmi tək ani.
Rəqibində olub Leyli hərasan,
Nihan suziştə qalmışdı pərişan.

Görübən qılmayırdı aşikarə,
Edirdi şövhəri birlə müdarə.
Nə dəm bulsaydı fürsət şövhərindən,
Tökürdü löleyi-tər gövhərindən.
Edib fəryadlər giryan olurdu,
Görüncə şövhərin xəndan olurdu.
Nə kəşfi-razə vardı iqtidari,
Nə kim, eşqə qalmışdı qərari.
Olub dilxəstəsi dərdi-fəraqin,
Cigərxuni-bəlayi-iştiyaqin.
Tənində qalmayıb tabü təvani,
Yanırdı atəşi-eşqə nəhani.
Süpehri-kəcruyi-neyrəngpərvaz,
Edib baziceyi-neyrəngini saz,
Çıxardı pərdədən bir tazə bazi,
Nümayan oldu rəngi cangüdazi.
Tutub təb nagəhan İbn Səlami,
Olub səfra füzun təlx oldu kami.
Füsusi ahü həsrəti-dərdi-timar,
Anı qıldı əlilü zarü bimar.
Olub bəstərdə nalanü pərişan,
Bulub cismində təb hər ləhzə tüğyan.
Qalıb bir neçə gün rəncuri-bitab,
Əlaci hüqqeyi-imkanda nayab.
Mərəz şiddət bulub axir tənində,
Nişani-mərg olub zahir tənində,
Fəlasəng əcəldən səngi cəstə,
Həyati-şişəsin qıldı şikəstə.
Çıxıb mülki-cəhandən verdi canin,
Rəha buldu qeyudindən cəhanin.
Fələk rəhm eyləməz pirü cəvanə,
Gedər, əlbəttə, kim gəlsə cəhanə.
Xoş ol kim, olmayıb məftuni-dünya,
Həmişə rəhlətə olmuş mühəyya
Ki, asari-bəqa yoxdur cəhandə,
Müəbbəd kimsə qalmaz bu məkandə.
Gələnlər cümlə meydani cəhanə,
Xədəngi-mərgədir bir-bir nişanə.
Əcəldir eyləyən bunda sətizə,
Həmavərdi aman bulmaz gərizə.
Güzər qıl, ey könül, tuli-əməldən

Ki, bulmazsan rəha çəngi-əcəldən.
Təəyyüş eyləyib xoşdil həmarə,
İrərsə sali-ömrün gər həzarə,
Sərəncami gənə mövti-fənadır,
Kəmali həmzəvalə müntəhadır.
Bu məbhəsdə eşit əqlin dəlilin,
Hesab eylə həman ömri-təvilin.
Ki, ruzi-əvvəli ruz pəsindir,
Cəhan baqi deyil, bu xud yəqindir.
Ərəblərdə ərusi-şuyi-mürdə
Olub bir il pərişanü fəsurdə,
Qalırmış xaneyi-matəmdə tənha,
Olurmuş zarü giryan biməhaba.
Cəhandan getdi çünki şuyi-Leyli.
İrişdi asimanə huyi-Leyli.
Olub qeydi-əlayiqdən rəhayab,
Gözündən aşikarə tökdü xunab.
Qəmi-Məcnundən gəldi-fəğanə,
Vəfati-şövhəri qıldı bəhanə.
Qəmi-eşqində Məcnun nəvanin.
Keçirdi həft xərgəhdən fəğanin.
Edib sərriştə əldə fövt şuyin,
Pərişan eylədi keysusi muyin.
Qılıb qəmxanəsin ah ilə rövşən,
Qəm ilə oldu həmdəm, etdi şivən.
Olub peyvəstə qəmlə duş ba duş,
Cidalıq möhnətdən eylədi cuş.
Muradınca edib əşar inşad,
Edib növhə, dəmadəm qıldı fəryad.
Nigahbandən fərağət, bimdən dur.
Mubərhən üzri-məqbul ilə məzur.
Şəkibi-xərmənin yaxdı sərapa,
Urub sərpəncə başə, oldu muya.
Dili-zarin fəğandən sir qıldı,
Fəğani aləmi dilgir qıldı.
Nədir, Nakam, gör bu aləmi-eşq
Ki, xoşdur aşiqə suzi-qəmi-eşq.
Edər nirani yadi-vəsli-canan,
Güruhi-aşiqə gülzari-rizvan.

ZEYD VƏFADARIN CANİBİ-MƏCNUNƏ

GETDİGİ VƏ İBN SƏLAMIN VƏFATINDAN
MƏCNUNİ-ZARİ XƏBƏRDAR ETDİGİ

Qədər çün eylədi hökmün nümayan,
Anı qıldı qəza icra kəmakan.
Dağıtdı bəzmini İbn Səlamın.
Götürdü dəhrdən asari-namin.
Necə kim, yoxdan olmuşdu pədidar,
Genə oldu həman mədumül-asar.
Görüb bu hali Zeydi-mehrkəstər,
Rəvan oldu bəsani-badi-sərsər.
Bulub Məcnuni səhrayi-bəladə,
Rəqibin mərgini qıldı ifadə.
Dedi: «Xürrəmdil ol, ey aşiqi-zar
Ki, daxi qalmadı ənduhi-əğyar!
Edib dilxahin üzrə dövr dövran,
Olubdur əxtəri-bəxtin firuzan.
Olub ol əbr kim, Xurşidə çirə,
Rüxi-məqsudini etmişdi tirə.
Edib badi-əcəl ol əbri nabud,
Bulubdur əbxəla rüxsari-məqsud.
Həman İbn Səlami-təng sirət
Ki, gənci-kamili qılmışdı qarət.
Edib rəhlət, qoyub xali-məqalin,
Güzəşt etdi sana ömri-giramin.
Giriftari olub dami-mümatin,
Sənə ol baqi, sənə verdi həyatin.
Edib Məcnuni bu peyğam xoşnud,
Dilində oldu bir ümmid mövcud,
Nişatindən gəhi rəqs etdi xəndan,
Gəhi ibrət alıb oldu pərişan.
Əgərçi bir cəhətdən oldu xürrəm
Ki, gəncindən kənar olmuşdu ər ğəm.
Vəli digər cəhətdən bitəhəmmül
Edib əncami-əhvalin təəmmül.
Sürurin eylədi ənduhə təbdil,
Sürudun eylədi əfğanə təhvil.
Edib növhə gəlib fəryadə bir dəm,
Olub giryan, qılıb icrayi-matəm.
Təvəccöh qıldı Zeydə etdi avaz,
Dəhanın açdı oldu nüktəpərdaz.

Dedi kim: «Rahi-eşqə tey edənlər,
Hərimi vəslə şövq ilə gedənlər,
Götürmüşlər aradən cismi-xaki,
Yetirmişlər vüsalə cani-paki.
Xoşa ol kim, irib həddi-kəmalə,
Hicabəti keçib irmiş vüsalə.
Bənəm naqis ki, hala xakbazəm,
Gəhi dərsuzü gəhi dərgüdazəm.
Bənimlə həm səbəq, həmpa cəvanan,
Olub hafiz, ediblər xətmi-Quran.
Vəli bən haliya vəlleyl xanəm,
Bəsani-kudakan bica dovanəm».
Dilində buldu axir eşq tüğyan,
Edib bədrud Zeyd ilə xüruşan.
Kəlamin xətm qıldı, ah etdi.
Gəlib cövlanə əzmi-rah etdi.
Dərunindən zühur etdi zəbanə,
Rəvan səhrayə getdi yanə-yanə.
Xoşa ol aşiqi-canbazi-Nakam
Ki, eşq içrə edibdir tərki-aram.
Qılıb qəflət hicabının dəridə
Açıbdır ruyəti-didarə didə.

## LEYLİNİN MƏCNUNİ DƏVƏTİ-VÜSAL QILDIĞI VƏ MƏCNUNUN VÜSALİ-CƏMALİ-LEYLİ-BİRLƏ FƏRXUNDƏHAL OLDUĞU

Məhəbbət ayətin təfsir edənlər,
Təəşşüq halətin təqrir edənlər,
Gəlib nitqə, açıb ləb şərhi-halə
Bu gunə bəs vermişlər məqalə –
Kİ, dərdi-eşqdən əfsurdə Leyli,
Bəlayi-hicrdən pəjmürdə Leyli,
Dilində daği-suzi-iştiyaqin
Tənində zəfi-dərdi-iftiraqin,
Təni azadə qeyd inü andən,
Dili asudə bimü pasibandən.
Bəsani afitabi-aləmara,
Qılıb hüsnü şüaın aşikara,
Xuraman gəşt edirdi subasu,
Güşadə ruy, Leykin dəst bər ru.

Birunində numayan tövri-matəm,
Dərunində firuzan atəşi-qəm.
Gözü xunbar, əhvali digərgun,
Dilində atəşi-sövdayi-Məcnun.
Olub orzə xədəngi-iştiyaqə,
Təhəmmül eyləyib zəxmi-fəraqə,
Edirdi zəxminə peyvəstə mərhəm,
Ümidi vəsli-Məcnuni dəmadəm.
Həmin münval ilə giryanü muyan
Həmin üslub üzrə növhəguyan,
Yetirdi matəmi-şuyin təmamə,
Həman dəm eylədi təbdilcamə,
Götürdü beytül-əhzanin o yerdən,
Gedib babi evində qıldı məskən.
Xədəngi-cangüdazi-firqəti-yar,
Sümüni-həsrəti-didari-dildar.
Dilində açdığından zəxmi-kari,
Şəbikə qalmamışdı iqtidari.
Keçib azərmdən, xovfi-xətərdən,
Cəfayi-mamdən cövrü pədərdən,
Urub bir püşt pa namusu nəngə
Çalıb qarvareyi-namusi səngə.
Açıb sirrin, edib tərki-mədara,
Nəhəftə eşqin etdi aşikarə.
Görüb fövt olduğun həngami-fürsət,
Zəmani-fürsəti bildi qənimət.
Vüsal ayinini etməkçün icra,
Edib şayəstə bir tədbir peyda.
Həmana etmədi bir ləhzə qəflət,
Vəfa rahində qıldı sərfi-hümmət.
Tutub bir xaneyi-xalidə məskən,
Anı qıldı behiştasa müzəyyən.
Qapatdı çarsudən fitnə babin,
Götürdü şahidi vüslət hicabin,
Gətirdi bavəfa Zeydi hüzurə,
Çıxardı razi-pünhanin zühurə.
Dedi: «Ey dərdməndanani-çarəkari,
Əlilü natəvanan qəmküsari,
Dəmi-eyşü tərəb fəsli-səfadır,
Bəhari-aləmara dilguşadır.
Degil həngameyi-möhnət bu həngam,

Bu dəm xürrəm olur ərvahü əcsam.
Naqafil eyləmə kamiləyar ol,
Nəsimi-sübh tək çapuksəvar ol!
Həzər biqərərü natəvanə,
Gülün qıl sinəsində aşiyanə
Kənari-əndəlibi pür gül eylə,
Gülü həm həmzəbani-bülbül eylə.
Məhi-Kənani dilgərmi-vüsal et,
Züleyxayi cəvanü tazəsal et.
Dəmi-qəflət degildir, etmə ehmal,
Bulub Məcnuni-məhcuri behər hal.
Gətir ol dərdmənd natəvani,
Vüsali-cananə mehman qıl ani.
Həzinəm künci-firqətdə bəni həm,
Anın vəslilə qıl bir ləhzə xürrəm.
Bənə mehman qıl ol ruhi-rəvani,
O olsun mehman, bən mizbani.
Görüm didarını ol ruhi-pakin,
Bilim hali-xərabü dərdnakin.
Olum pərvaneyi-şəmi-cəmalin,
Qılım canımı qurbani-vüsalin.
Ki, dövrani-zəmanə biamandır,
Həmişə kəcru namehribandır.
Edər nagah peyda bir sətizə,
Qalır bu dərdə həsrət rəstxizə.
Zəmani-fürsəti fövt etmə, zinhar.
Ki, fitnəxoftədir nabud əğyar».
Açıb gənci, edib amadə axər,
Mürəssə xameyi-zər tarü faxər.
Ona şayan olan zərdən, gövhərdən.
Ənbərü üdi-xamü müşki-tərdən.
Götürdü eylədi təslim Zeydə,
Edib təqdimini təlim Zeydə,
Dedi: «Durma, rəvan ol kuhsarə
Ki, yoxdur tabım artıq intizarə».
Götürdü buqçayi Zeydi-yeganə,
Tutub səhra yolun oldu rəvanə.
Bulub səhradə Məcnuni nəvani,
Görüb bir məhbəsi-bidərdə ani-
Ki, səqfidi süpehri-nilufərgun,
Cədari-daməni-gərduni-varun.

Verib ol aşiqi-zarə bəşarət,
Dəmi-vəsl olduğun qıldı işarət.
Nə kim, Leyli ona etmişdi irsal,
Anı Məcnunə təqdim etdi filhal.
Olan keyfiyyəti ol pakzadə
Müfəssəl eylədi bir-bir ifadə.
Məhəbbət mülkünün xaqani Məcnun,
Güruhi-aşiqan soltani Məcnun,
Bəlayi-həsrətin məhzuni Məcnun
Cəfayi-firqətin dilxuni Məcnun,
Bu ruhəfza nəvidi kim, eşitdi,
Həzərasa həzar avazə etdi.
Fərəhdən gahi oldu övcpərvaz,
Tərəbdən oldu gahi rəqspərdaz.
Yıxandı çeşmeyi-vəslü səfadən
Mütəhhər çirki-hicranü cəfadən.
Düşüb xaki-niyazə oldu rumal,
Mükərrər səcdeyi-şükr etdi filhal.
Əz an pəs buqçeyi-zərtari açdı,
Süruri gözlərindən dürr saçdı.
Götürdü cameyi-zərrini yeksər,
Edib təqbil bir-bir qıldı dərbər.
Dilində nəşati-didari-canan,
Fərəhnakü sərayanü qəzəlxan.
Hərimi-vəslətə oldu rəvanə,
Rikabində sipahi-Xosrovanə.
Nə ləşkər, cümləsi dərəndəpeykər,
Sipəhsalari şiri tizixəncər.
Nə ləşkər, cümləsi müfadü çalak,
Fədakarü sədaqətməndü səffak.
Nə ləşkər, cümləsi amadeyi cəng
Mühəyya cümləsi şəmşir bər çəng.
Olunca rahru Məcnun bəhri an,
Olurlardı anın əqibincə puyan.
Nə yerdə eyləsəydi məks bir dəm,
Olurlardı ona bir həsənd möhkəm.
Bu darat ilə, bu şövkətlə Məcnun
Edib qəti-məsafə tey hamun.
Səri-kuyi-dilarayə irişdi,
Dəri-firdovsi-əlayə irişdi.
Şitaban Zeydi-dilagah filhal,

Gedib Leylayə qıldı ərzi-əhval –
Ki, eşqin düşgünü biçarə Məcnun,
Qəmindən bağrı parə-parə Məcnun,
Gəlib dərgahdə olmuş cəbinsa,
Açıb çeşmi-ümidin həlqəasa.
Ümid lütf edər biçarə səndən,
İcazət gözləyir didarə səndən
Bilib keyfiyyəti Leyli həman dəm,
Rəvan oldu rəvan sərməstü xürrəm.
Nə bak etdi pələngi-tündxudən
Nə qıldı vəhm şirikinəcudən.
Gəlib mehmanın istiqbal qıldı
Tənim mehmanına pamal qıldı.
Görüb yek digərin ol iki aşiq,
Nümayan oldu əsrari-həqayiq.
Edib fəryad qıldı hər biri cuş,
Məaniq düşdülər torpağə mədhuş.
Girib bir püstə ol iki badam,
Həmağuş oldular buldular aram.
Açıb bir saqdə iki şəqaiq,
Gəlib bir bürcə Mehrü Məh müvafiq.
Dərağuş eyləyib yek digərini,
Fəramuş etdilər kəndilərini.
Səbağü vəhşiyan çəkdi həsari,
Hərasət eylədi ol iki yari.
Güzər qılsaydı gər bir kəs o suyə,
Düşürdi gərdəni dami-koruyə.
Tutub anı biri eylədi çarə,
Qılardı digərani parə-parə.
Bu halətdən olub vaqif qəbilə,
Edib yeksər cəvanü pir veylə.
Gəlib həngameyi-heyrətfəzayə,
Baxıb bu vəhşətəfza macərayə.
Təmaşa qılmağə ol iki zari,
Cəsarət eylədilər iztirari.
Pələngi-tizi-cəngü şiri səfak,
Edib bir neçəsin üftadeyi-xak.
Qalanlar xofdən qaçdı kənarə,
Edib bir bəd mənzildən məzarə.
Dedilər, eyləyib əfsus, heyrət
Ki, nəfsani degildir bu məhəbbət.

Bu eşq olsaydı gər şəhvət həvasi,
Olurdu münəkis, həm macərasi,
Bu şirü bu pələngü bu dərdü dam,
Bu iki aşiqə olmazdılar ram.
Demişlər məsəldir bir vəlidən,
«Şenidən key, buvəd manəndi-didən».
Xəbər olsa olurdu iştibahi,
Künun eynü yəqin gördük kəmahi
Ki, bunlar aşiqi-məsumlardır,
Dürri-gəncineyi-məktumlardır.
Həvayi-nəfsdəndirlər mübərra,
Əfafi-asim ilə mütərra.
Əyandır kim, bu iki cismi tinin,
Bu iki pakzadü pakdinin,
Degil sevdaları eşqi-məcazi,
Həqiqi eşqdir bu eşqbazi.
Olub bu göftgu bir lə rəvanə,
Dağıldı getdi hər kəs bir məkanə,
O iki aşiqi-zarü cigərsuz
Güzərgəhdə qalıb ta nimeyi-ruz.
Bəsani-mürdəgan bixişü bihuş,
Vəli yek dəgəri birlə həmağuş
Olub dilmüztərib Zeydi-yeganə,
Gəlib axər bəri üftadəganə.
Gülabəfşan olub oldu füsunsaz,
İfaqət buldu, ol iki sərəfraz.
Həman bihuşlər çün buldular huş,
Qalıb bir dəm bəsani-nəqş xamuş.
Bu heyrət buldu payan axəri-kar,
Olub Leylidə bir qüvvət pədidar.
Həzaran şərmlə oldu xuraman,
Tutub Məcnun əlin lərzanü lərzan,
Gətirdi qəsirə mehmani-əzizin,
Fəda qıldı ona cani-əzizin.
Birun dərdə Zeydi-pakdaman,
Olub ol gənci-pünhanə nigəhban.
Hərəmin subəsu piramünində
Mütəlsəm həsn idi fövci-dərəndə.
O suyə bir məkəs etsəydi təyaran,
Edirlərdi anı xak ilə yeksan.
Hərasindən sübai tizçəngin,

Hücumi səhmnakindən pələngin.
Dəxi bir kimsə etməzdi cəsarət,
Ki, ol ətrafdə etsin nəzarət.
Qılıb mehmanini dilşad Leyli,
Edib təzimini müzdad Leyli.
Keçirdi sədrə Məcnunin məqamin,
Ləbin bus etdi, şirin qıldı kamin.
Açıb xani-vüsalin laübali,
Gətirdi bəzmə minayi-vüsali.
Təmam etməkçün ikrami-karin,
Mükəhhəl eylədi çeşmi-xumarin.
Edib pirastə hüsnün o məhvəş,
Vücudin eylədi mehmanə peşkəş.
Gəlib Məcnuni-cansuzə müqabil,
Qılıb bazuyi-siminin həmayil.
Sarıldı boynuna ol pakzadın,
Kənari busənin açdı məzadın.
İki ikən cismi bir canın müqəddəm,
Bulub peyvənd bir oldu cəsəd həm.
Verib yek digərin dadiı-məramın,
Alıb əyyami-hicran intiqamin.
Olub yek digərə piçidə can tək,
Olub məlsuq bahəm tuəman tək.
Biri bixud bəsani-nəqşi-divar,
Biri bixiştənhali qəfəsvar.
Bu gunə gərçi ol iki diləfruz,
Bahəm piçidə qaldılar şəbənruz.
Vəli içrazdən xalidi xanə,
Qərəzdən qalmamışdı bir nişanə.
Degildi kargər iqraz andə,
Yox idi qəlbkoş əmraz andə.
Degildi sui-niyyət andə mövcud,
Ki, ortadan qərəz olmuşdu nabud.
Gəlib çün halə, buldular əfaqət,
Vəleykin oldular sərməstü heyrət
Edib müstəqbəli mazini fəramuş
Olub hər ikisi məhbutü xamuş.
Nə Leyli göftguyə buldu qüdrət,
Nə Məcnun buldu ləb açmağa qüvvət.
Füsuni-eşq edib təsir hər dəm,
Bu əfsə bülbülani etdi əbkəm.

Edib yek digərin hüsnün təmaşa,
Dəhan bənd oldular təsvirasa.
Dili-suzanlarında göftgu çox,
Zəbandə təqati-şərhi-ələm yox.
Bu gunə qaldılar ta sübh samit,
Nigəh dərkar, nitqü guş sakit.
Genə Leyli açıb nitqi-dilaviz,
Süxənpərdaz olub oldu gövhərriz.
Kİ: «Ey möhnəti-rəsidə dərd didə,
Cəfa bordə, qəmi-hicrani kəşidə.
Nə oldu ki, bu gunə əbkəm oldun,
Nəçün nitqin tutuldu, əbsəm oldun?
Ki, sən bir bülbüli-atəşzəbansən,
Nədir bais künun bəstədəhansan?
Rüxin etdikdə bülbüldən nihan gül,
Qalıb məhcur, olur xamuş bülbül.
Açıb rüxsarini gül güli-zəmani,
Məqam etdikdə bülbül gülüstani,
Olur vəsli gül ilə təzə bülbül,
Gülə qarşı qılır avazə bülbül.
Edər əzbər həzaran dastani,
İrir əflakə gülbanın fəğani.
Edir hicran qəmin təqrir bir-bir,
Qılır dərdi-dilin təfsir bir-bir.
Nə məna vardır bunda bəyan et,
Bəni agah qıl, sirrin əyan et-
Ki, ta vəsli ləbimdən dur idin sən,
Cəmalimdən bənim məhcur idin sən.
Olub zövqi-vüsalimdən cida sən,
Fərağə olduğun dəm mübtəla sən.
Edib xoş şerlər inşad o dəmlər,
Qılırdın ruzü şəb fəryad o dəmlər.
Həzarasa edib avazələr saz,
Olurdun gahi-bigah nəğməpərdaz.
Şərabi-vəslimi əknun edib nuş,
Olubsan valehü məbhutü xamuş.
Nəçün bülbül kimi muya olubsan?
Nəçün tuti kimi guya olubsan?
Cəfayi-hicri təqrir eyləməzsən?
Səfayi-vəsli təfsir eyləməzsən?
Nəçün boylə olub bəstə dəhanin,

Vüsalimdən tutulmuşdur zəbanin?»
Edincə bu nükati guş Məcnun
Xüruşan oldu, qıldı cuş Məcnun.
Dedi: «Ey mətlə-huri-həqiqət!
Təcəlligahi-ənvari-hürriyyət,
Nümudinlə sənin bən binumudəm,
Vücudinlə sənin bən qomvücudəm
Bən isəm didə, sənsən nuri-didə
Olur binur, olursa kur didə.
Bənəm bir ləfz kim, mənası sənsən.
Əsər olmazsa səndən olmazam bən.
Bənim cismim degil səndən əsərsiz,
Olurmu sayə cismi-mötəbərsiz?
Sənin bən sayənəm, ey sərvi-dilcu!
Vücudim cümlə sənsən muybamu.
O dəmdən kim, sən olmusan şəkkərxənd,
Ləbi-ləlin bəni qılmış zəbanbənd.
Bənimlə ah kim, yar oldu yarım,
Sərapa münəkis olduqda karım.
Açıb pərrim bəsani-cüreyi-baz,
Təzərv əqibincə bən etdikdə pərvaz.
Təzərv oldum olub bəndən gürizan,
Bəni səhrayə saldı oldu pünhan.
Künun kim, olmuşam bitabü xəstə,
Zəbuni paşikəstə, pər şikəstə.
Olub nabud mexlab təvanım.
Təzərv olmuş bənim həm aşiyanim.
Bəni mehman edibsən, ey dilara!
Olubdur süfreyi-cibin mühəyya.
Qidayi-ruhbəxşa intiha yox,
Nə sud, əmma ki, bəndə iştəha yox.
Ki, eşqi-hüsnünlə sirdir can!
Cəmalın qüvvəti-canımdır bəhər an.
Degil bir dəm cida səndən hüzurim
Ki, səndən qeyri dərk etməz şüurim.
Nəyim var, ya nəyəm, fəhm etməzəm bən,
Nə isəm, mubamu-o cümlə sənsən.
Olub bənlik aradən məhv yeksər,
Sənin hüsnündür ancaq cilvəgüstər.
İkilik qalmamışdır bu miyandə.
Vəli zahir görən kəslər cahandə.

Sənə Leyli, ğənə Məcnun deyirlər,
Edirlər səhv, digərgun deyirlər.
Həman Leyli də sən, Məcnun da sənsən,
Həman Məcnun bənəm, Leyli də həm mən.
Əgər zahirdə vardır iki peykər,
Vəli mənadadır bir sirrə məzhər.
Bu sirri əndəlibi-Gülşəni-raz
Bəyan etmiş, olub o, avazə-pərdaz:
«Ke, hər kəs ra be del şəkk nist,
Yəqin danəd ke, həsti-coz yeki nist.
Mən o, ma o, tu u, həst yek çiz –
Ke, dər vəhdət nəbaşəd hiç təmiz».
Edib bu dürləri isar Məcnun,
Kəmali-vəcddən oldu digərgun.
Olub vicdani-Leyli həm ziyadə,
Bülurin saidin qıldı güşadə.
Çəkib aguşə Məcnun nəvanin,
Edib cananilə peyvəstə canin.
Müənbər kiysuvanin etdi əfşan,
Anı ənbər içində qıldı pünhan.
Öpüb hər ləfzinə min gəz dəhanin,
Əda etdi verib müzd zəbanin.
Açıldı tazədən bazari-busə,
Mükərrər qıldı rövnəq kari-busə.
O rütbə oldu gərma gərm bazar –
Ki, oldu can bəha kəlayi-didar.
Dili-Leylidə buldu eşq şiddət,
Dü bala oldu Məcnunda məhəbbət.
Təmaşayi-cəmali-yar saqi,
Olub Məcnunun əfzun iştiyaqi.
Pəyapey eylədi ol badədən nuş,
Olub dilgərm, sövda eylədi cuş.
İrişdi şövqi həddi-səhmnakə,
Qərib oldu dili-paki həlakə.
Edib şövqi-deli təsir canə,
Toxundu tigi-axər üstüxanə.
Dilində qalmadı tabi-nəzarə
Qəbasin çak edib, çıxdı kənarə.
Edib bir nəreyi-hu aşiqanə,
Gənə səhralərə oldu rəvanə.
Gəzib səhradə aqibincə sipahi,

Cəhani-eşqin oldu padşahi.
Sərasər məhv olub asari-firqət,
Firaqi olmuş idi eyni-vəsalət.
Edərdi zümzümə xəndanü xürrəm,
Dəmadəm sirri-vəhdətdən urub dəm.
Məbəyən söyləyib zövqi-vüsali ,
Çəkirdi nəzmə nasüftə lali.
Təəşşüqdür həman iksirə firuz,
Təəşşüqdür həman nuri-diləfruz.
Ki, andən bulduğu feyz ilə Adəm,
Məqami-qürbdə oldu mükərrəm.
Edib nabud əkdar iyubi.
Təəşşüqdür edən ehya qülubi.
Təəşşüq sirdir məktum, Nakam
Ki, vaqif olmaz andən aşiqi-xam.
Bu sirri aşiqi-dilxundan sor!
Təəşşüq nolduğun Məcnundan sor!..

### MƏCNUNİ-XÜCƏSTƏXİSALİN ŞƏRHİ-İSMƏTİ VƏ LEYLİ MƏLƏKMİSALİN BƏYANİ-İFFƏTİ

Gümani-nabica etmə ki, Məcnun
Həvayi-nəfsinə olmuşdu məftun.
Bəsani-eşqbazani-zəmanə
Olub dildadəyi-xubani-cəhanə.
Salatü somdən məhrumü məhcur.
Fərasətdən kənar, adabdan dur.
Şəqəfnak idi adi bir vüsalə,
Edərdi nəfsinin kamincə nalə.
Məazallah, bu bir zənni-xətadır,
Ki, Məcnun əqləhli-vəfadır.
Görüb dövrün cəfayi-nagüvarin,
Bilib sirrin süpehri-kəcmədarin,
Olub vaqif rumuzi-asimandən
Xəbər olmuşdu əsrari-nəhandən.
Həvayi-nəfsini etmişdi mədum,
Mələksirət olub, olmuşdu məsum.
Anın xülqi kərimindən dərü dam,
Anınla ram olub bulmuşdu aram.
Edərdi nəzm, şer nüktəamiz,
Təmami bikrməzmunü dilaviz.

Nə dəm qılsaydı, inşad nəşidə
Olurdu əksəri qürra qəsidə.
Bəliğü həm fəsihü nüktəpərvər,
Həzaran nüktə, hər ləfzində müzmər,
Məqalətindən ədna diqqət ilə,
Xəyalətində vazeh höccət ilə,
Olur məşhud ərbabi-kəmalə
Ki, Məcnun malik olmaz ol məqalə.
Bulub həqqi, keçib hübbi-səvadən,
Olub fariq şüunati-fənadən.
Fəna əndərfənadə cayigahi,
Bəqa əndərbəqadə qürbücahi.
Hərimi bəzmi-xasi vəhdət idi,
Həmişə məsti-cami-vəslət idi.
O iki yar yekrəngü müvafiq,
Biri Leyli, biri Məcnuni-sadiq.
İkiydi zahiri peykərlərinin,
Biri qeyri degildi digərlərinin.
Bulub yek digərində nuri-zati,
Fəramuş eyləmişlərdi süfati.
Olub ayinəsi yek digərinin
Ləqasin seyr edib kəndulərinin.
Görürdü yek digərdə Turi-nurin
Şəqəfnaki olurdu nuri-Turin.
Təcəlligah idi yek digərinə,
Şəqəfnak idilər kəndulərinə.
Degildi talibin qeyrisi mətlub,
Həmana aşiqin eyni idi məhbub.
Həman Məcnun idi Leylayi-məhru,
Həmin Leyliydi Məcnun muybamu.
Əgər olsaydılar tabe həvayə,
Yaxılmazlardı niyrani-cəfayə.
Olurlardı hüsuli-kamə mail.
Olurdu kami-nəfsi-şum hasil.
Vəleykən olmayıb nəfsin qulami,
Edib mətrük bu məzmun kami.
Həqiqət aləmində oldular şad,
Əlayiqdi bəri, möhnətdən azad.
Olub məsti-şərabi-cavidani,
Atıb bir xütvə keçdilər cəhani.
Keçər darindən, əlbəttə, Nakam!

Bu meydən kim ki, nuş eylərsə bir cam.

### NAZİMİN BARİ-DİGƏR SAQİYİ-MƏNƏVİDƏN İSTİMDAD ETDİYİ

Gətir, saqi, şərabi-ləlguni
Ki, oldur şəbrəvanan rəhnumuni,
Ləbaləb eyləyib cami-fütuhi,
Anınlə rövşən eylə çeşmi-ruhi.
Mənazel pürxətər, tarikdir rəh,
Bəni hal mənazeldən qıl agah.
Dilim aşüftədir, bən bidiləm,
Əlim tut, saqiya, mey ver, əliləm.
Gətir, saqi, meyi-danşifizudi,
Edib ləbriz cami-qəmzüdudi.
O meydən kim, şərabi-qeybdir ol,
Sizayi-məclisi lağibdir ol.
O meydən ver kim, oldur badeyi-pak,
Səfabəxşi-dili-ərbabi-idrak.
Təəllül eyləmə, saqi, xərabəm,
Kərəm qıl, siyxi-möhnətdə kəbabəm.
Edib bir dəm bəni məsti-meyi-nab,
Bəni qıl ol meyi-nab ilə sirab –
Ki, cami-cani-pak müqbulandır,
Səbusi sineyi-sahibdilandır.
O meydən ver kim, ondan eyləyən nuş,
Olub yeksər vücudi danişü huş.
Məhəbbətdən rəvayət eyləmişlər,
Həqiqətdən hekayət söyləmişlər.
Bulub şiddəti-qəm deyrinə, saqi,
Ələmdən təng olubdur sinə, saqi!
Hanı mina, hanı sağər, hanı mey?
Gətir cami, bənə mey ver pəyapey.
O meydən kim, olur pərvərdeyi-ruh.
Odur tufani-qəmdə kəşteyi-Nuh.
Həman meylə dilim məsti-əbəd qıl!
Bəni varəstəü qeydi-xirəd qıl –
Ki, bulsun tabi-dil matəm qəmində,
Gətirsin tab Leyli matəmində.
Edəndə nalə bu matəmdə Məcnun,

Qılanda naləsi dünyayi dilxun,
Məzari-Leylini bus etdiyi dəm,
Çəkib fəryad, əfsus etdiyi dəm.
Edib naləş, deyib cananü canan,
Verəndə türbeyi-canandə can,
Gəlir ol dəm mələk fövci xüruşə,
Gəlir əbdandə ərvah cuşə.
Təğafül eyləmə, saqi, şitab et!
Verib badə, bəni məsti-şərab et.
Bəni qıl öylə məstü laubali
Ki, dildə qalmasın möhnət xəyali.
Bulub bu dərdi-dilsuzə təhəmmül,
Cəhanin etməyim halin təəmmül.
Olum Nakam tək təslimi təqdir,
Edim bu matəmi-cansuzi təqrir.

### LEYLİNİN XƏZANİ-MÜMATİ NÜMAYAN OLUB ƏFSURDƏHAL OLDUĞU VƏ BƏHARİ-HƏYATİ PAYAN BULUB DARİ-BƏQAYƏ İRTİHAL QILDIĞI

Giriftarani-alami-müsibət
Cigərxunani-suzi-daği-həsrət
Xəzanin dərdi-bidadin görənlər.
Həzarin hali-naşadin görənlər,
Olub vaqif cəfasindən xəzanın,
Pərişan olduğundan gülüstanın,
Qılıb əfsus, edib təqrirə ağaz,
Bu tərz ilə olublar növhəpərdaz –
Ki, bir dəm kim, xəzani-afətamiz,
Olub mülki-çəməndə atəşəngiz
Gülüstani yaxıb etmişdi viran,
Çəmən arayişin qılmışdı talan.
Gedib bülbül, gülü solmuşdu bağın,
Zəğənlər bülbülü olmuşdu bağın.
Olub şaxi-gül üzrə cilvəgər xar,
Səbah olmuşdu dəmsədü dilazar.
Olub yəxbəstə abi-safü cari,
Həvadən öyrənirdi şişəkari.
Hümayun çətri-səbzi şaxi-takin,
Düşüb fərsudəsi olmuşdu xakin.
Təaddəsi hərasindən xəzanın,

Nihan olmuşdu əzhari-cəhanın,
Təni-ərər bürühnə, sərvi-məhzun.
Sərazirü pərişan bidi-məcnun.
Çəmənlər subəsi aludeyi-xak,
Çəhan matəmzədə, gülşən kədərnak.
Bu dilfərsaü dərdəfza zəmandə,
Xəzani-zəhrbarü biəmandə.
Olub Məcnundən məhcur Leyli,
Ələmdən oldu həm rəncur Leyli.
Xəzani-xəstəgi, həm sərsəri rənc,
Bəhar hüsnün etdi məzhəri rənc.
Xəzani olsa da hər gülüstanin,
Bəhari həm olur bir dəxi anın.
Vəli əfğan ki, bağı-zindəgani,
Olub əfsurdə bulduqda xəzani.
Dəxi andə bəhar olmaz numayan,
Bəhar etməz o bağı bir də xəndan.
Olub mənası zahir bu bəyanın,
Vəzan oldu həvasi bu xəzanın.
Solub rəngi-güli-rüxsari-Leyli,
Olub afətzədə gülzari-Leyli
Saraldı cümlə övraqi-nihali,
Təni incəldi oldu mu misali.
Hilalasa olub bədri-müniri,
Şəlalə döndü sərvi-dilpəziri.
O gün kim, gördü Məcnuni-fikari.
O kani-eşqin oldu həm əyari.
Rümuzi-eşqi fəhm etdi kəmakan,
Qarışdı nəhr bəhrə oldu ümman.
Bulub şiddət dilində hübbi-Məcnun,
Həzaran bar eşqi oldu əfzun.
Xətti-rüxsari-yar olduqda məşqi,
Nihayət mərkəzin bulduqda eşqi.
Kəsildi rişteyi-ümmidi-vəslət,
Digər bar oldu bəndi-dami-firqət,
Düçar oldu bəlayi-iftiraqə,
Yaxıldı, yandı nari-iştiyaqə.
Füzun olduqca nari-iftiraqi,
Füzuntər oldu suzi-iştiyaki.
Təəşşüqi-atəşi etdikcə tüğyan,
Dilində buldu tüğyan nari-hicran.

Şəkibi xirmənınə düşdü əxkər,
Qüvayi-cismini yaxdı sərasər.
Düşüb tabü təvandən axərkar,
Cüdalıq möhnətindən oldu bimar.
Vücudin eylədi təblərzə lərzan,
Ləbində oldu təbxalə nümayan.
Olub balinə axır sər nəhadə,
Təni oldu fəraşə üftadə.
Gəlib balini üzrə madəri-zar,
Görüb Leylini çeşmin qıldı xunbar.
Öpüb Leyli qədümi-madərindən,
Götürdü mecəri-sirri-sərindən,
Güşad etdi ləbi-yaqutgunin,
Mübəyyən söyədi razi-dərunin.
Dedi: «Ey mam, gəlmiş vəqti-rəhlət,
Künün guş eylə bəndən bir vəsiyyət.
Ki, ta mövcud idi tabü təvanım,
Yaxıldı atəşi-aləmə canım.
Təəşşüq atəşin puşidə tutdum,
Səfayi-aləmi yeksər unutdum.
Künun bitab dərdi iftiraqəm,
Mərizi-natəvani iştiyaqəm.
Ki, bən fərsudeyi-alami-eşqəm,
Əsiri-mübtəlayi-dami-eşqəm.
Demə İbn Sələmə yar idim bən,
O dəm həmaşiyani-mar idim bən.
Bənəm aşüfteyi-sövdayi-Məcnun.
Giriftari-rüxi-zibayi-Məcnun.
Vəli Məcnun degildir ol yeganə,
Odur aqilitəri-əhli-zəmanə.
Adıdı Qeys, anı Məcnun bən etdim;
Salıb səhrayə, digərgun bən etdim.
Hənuz ol dəmdə kim, məsum idim bən,
Müqimi-məktəb məlum idim bən.
O dəm təhsili-dərsi-eşq edərdim,
Anın əbrusini sərməşq edərdim.
Olub Məcnun bənim məftunim ol dəm,
O dəmdən aşiqəm Məcnunə bən həm.
Həyatımda dəxi yox ehtimalim,
Yəqinimdir bu dəmdə irtihalim.
Səni dərdi-dilimdən vaqif etdim.

Dəxi bedrud, ey madər ki, getdim.
Həyatim səati bulduqda payan,
Mümatim vəqti olduqda nümayan,
Mümatimdən olur agah Məcnun,
Gələr bu matəmə hali-digərgun.
Qılar əfqan töküb xunabi-həsrət,
Fəğanından olur peyda qiyamət.
Demə məcnundur, o ya bolhəvəsdir,
Girami tut ki, sahibi-nəfəsdir.
Anı bən necə tutmuşsan girami,
Ona bəndən füzun et ehtirami.
Qılıb hökm qübar məqdəmindən,
Hənutim eyləyib çeşmi-dəmindən.
Bəni təkfin qıl-xunin kəfənlə,
Müləbbəs eylə gülgün pirhənlə.
Ərusi-tazə tək dəfn məzarə
Ki, etmiş bağrımı qəm parə-parə.
Şəhidi-ərseyi-peykari-eşqəm,
Qətli-xəncəri-xunxari-eşqəm.
Həman bulduqda təchizim nəhayət,
Edib ağaz təfsiri hekayət,
Səlam et bəndən ol əfsurdəhalə,
Usanma, bəst ver bir dəm məqalə.
Bəyan et, söylə kim, ey aşiqi-pak!
Əsirin Leyliyi-zarü cigərçak.
Olub sabitqədəm rəsmi-vəfadə.
Yaxıldı şəm tək leyl bəladə.
Sənin eşqin qılıb məhvuz candə
Sənin eşqinlə ömr etdi cəhandə.
Olub məşğul eşqinlə həmarə,
Sənin eşqində oldu bağrı yarə.
Sən idin daima zikri zəmani,
Sən idin hər zaman fikri cənani.
Qılıb təsir axır iftiraqin,
Anı etdi pərişan iştiyaqin.
Edib aləmi eşqin tuşeyi-can,
Ədəm səhrasinə getdi şitaban.
Sənin adın olub virdi-zəbani,
Tənindən eşqin ilə çıxdı cani.
Künun xəlvətsərayi cavidandə
Sənədir müntəzir bağİ-canandə.

Cəhandə qaldığı məhcur bəsdir,
Qəmindən olduğu rəncur bəsdir.
Daxi aldanmasın baca xəyalə.
Təvəqqüf etməsin gəlsin vüsalə.
Ki, bunda yox daxi təzviri-əğyar,
Olur bunda həmana yar ba yar.
Olub bu bəzmi-vəhdətdə həmağuş,
Edəlim cami-nab vəsləti nuş».
Sözün xətm etdi Leyli, oldu diltəng
Gülüstani-bəqayə qıldı ahəng.
Fəryad etdi yari-dərdnakin,
Dedi: «Ya dust!» verdi cani-pakin.
Görüb bu hali mam binəvasi,
Təğəyyyür buldu əhvali-həvasi.
Başından mecərin atdı kənarə,
Qəbasin yeksər etdi parə-parə.
Olub nalan bülənd etdi sədasin
Əyan qıldı qiyaməti-macərasin.
O rütbə nalə qıldı, etdi əfğan
Ki, aləm naləsindən oldu nalan
Sərindən etdi yeksər kəndə muyin
Xəraş etdi urub sərpəncə ruyin.
O payə qıldı muyə, oldu nalan,
O payə etdi növhə, oldu giryan –
Ki, bağrı giryəsindən xunə döndü,
Kənari-damən Ceyhunə döndü.
Edib min ahü min əfsus axər,
Edib Leyli yüzündən bus axər.
Gülabi eylədi aludeyi-ud.
Gülü qıldı gülabi-alud.
Tənin məşmum edib tər ilə,
Qılıb tətəyib odü ənbər ilə.
Nəhadə qıldı bir tabuti-pakə,
O gənci-gövhəri dəfn etdi xanə.
Bu xak ol xaki-əfsunkardır kim,
Bu xak ol xaki-adəmxardır kim,
Olursa təəsür giryəsini çak,
Baxırsa diqqət ilə çeşmi-idrak,
Çıxar hər zərrəsindən bir güləndam
Ki, xak etmiş anı xaki-siyəhfam.
Xoşa ol kim, bu dəhr bacəfayə,

Bu şöhr koşü ərusi bivəfayə.
Nə dil vermiş, nə azurdədil olmuş,
Nə zir bardə padərgil olmuş.
Ki, bu dünya deyil dari-iqamət,
Bu dünyadır güzərgahi-qiyamət.
Gəlib kim ki, edərsə məks bir dəm,
Zəruri eyləyir rəhlət, gedər həm.
Nədir, Nakam, bu qövlü mükərrər
Ki, məşruhi edərsən şərhi-digər.
Gedib yaran bulub məclis nəhayət,
Vəli nagüftədir hala hekayət.
Cəhanın bilməyən kimdir cəfasın,
Bu qəddarın görən kimdir vəfasın?
Necoldu Adəmü Davudü Musa?
Necoldu Nuhü Yəqubü Məsiha?
Hanı aləmdə Bilqeysü Süleyman?
Züleyxayi-cəvanü Mahi-Kənan?
Hanı Veysə, hanı Əzrayü Şirin?
Hanı Vamiq, hanı Fərhadü Ramin
Hanı Keyxosrovü Bəhramü Bəhmən?
Hanı Samü Nəriman, Givü Bijən?
Keçənlər cümlə getmişlər cəhandən,
Gələnlər həm gedən bu xakdandən.
Rəha mümkün deyil çəng-əcəldən,
Mühəyya ol, saqın tuli-əməldən.
Alıb keyfiyyəti-Leylidən ibrət,
Necoldu gör o mirati-həqiqət?
Tilsimi-xakdə nabud olubdur,
Qalıb ismi, təni məfqud olubdur.
O yekta qönçəsi gülzari-hüsnun,
O rövşəni-mətləi ənvari-hüsnün.
Xəzani-fövtdən oldu pərişan,
Səhabi-mövt içində qaldı pünhan.
Olub pirü cəvan matəmgüzari,
Sərasər aləm oldu sugüvari.
Təəşşüqdə o mahin rüfətindən,
Kəmali-isməti ndən, iffətindən.
Bulub şöhrət, olub agah aləm,
Məzari oldu hacətgah aləm.
Fiyuzi-eşqdən, Nakam, axir,
Olur əsrarə aşiqlər məzahir.

Edib mətlubini eşq ilə hasil,
Olurlar eşq ilə həm həqqə vasil.

### MƏCNUNUN VƏFATİ-LEYLİDƏN XƏBƏRDAR OLDUĞU VƏ NƏQDİ-HƏYATIN TÜRBEYİ-LEYLİDƏ NİSAR QILDIĞI

Mənayi-eşqdə qurban olanlar
Verib can, vasili-canan olanlar
Bu tərz ilə edib ağazi-əfqan,
Olublar ruhi-Məcnunə sənəxan –
Ki, Zeydi-müstəsməndü zarü qəmxar
Olub Leyli vəfatından xəbərdar.
Sərapa caməsin qıldı siyəhgun,
Gəribani dəridə, didə pürxun.
Edib qeydi-səvadən qət peyvənd,
Rəvan oldu həman divanəmanənd.
Hərimi-türdeyi-Leyladə əvvəl
O tabini müzəccəi əladə əvvəl,
Gedib matəm rüsumin qıldı icra,
Qiyamət ibtidasin etdi peyda.
Pədidar eylədi fəryadü əfğan,
Savurdu başına xak, oldu giryan.
Mükərrər eylədi əfsus axər,
O xaki-paki qıldı bus axər.
Digərgun halda nalanü dilriş,
Rəvani-səhra təriqin qıldı dərpiş.
Bulub səhradə Məcnuni-fikari,
Axıtdı xuni-çeşmin iztirari.
Gəhi giryan bəsani-əbri-nisan,
Gəhi rəddi-xuruşan tək xuruşan,
Bəri-Məcnundə fəryad qıldı,
Həman səhrani həşrabad qıldı.
Görüb bu haləti biçarə Məcnun,
Həvasin iztirab etdi digərgun.
Dedi: «Ey Zeyd, bu matəm nəçündür?
Bu əfsusin nədir, bu qəm nəçündür?
Libasındır nəçün yeksər siyəhgun?
Kimin dərdi səni etmiş cigərxun?
Sənə nə etmiş genə bəxti-siyahin?
Ki, olmuş boylə atəşnak ahin?»

Həzaran üsrət ilə Zeydi-nalan,
Zəbani lərznakü çeşmi giryan,
Dedi: «Ey bülbüli-zarü müşəvvəş!
Ümidin gülşənin yaxmışdır atəş.
Süpehrin dövrü digərgun olubdur.
Derəfşi-taleyin varun olubdur.
Həman Leyli ki, etmişdi cəmali
Cəhani rövzeyi-cənnət misali.
Xəzani-nabihəngami məmatin
Edib əfsurdə gülzari-həyatin.
Əcal qılmış anı məknun əknun,
Təni xak içrədir əknun məknun.
Sənin eşqinlə bulmuşdu həyati,
Sənin eşqində həm buldu məmati.
Nəsibi dərd olub bu xakidandən,
Qəmi-eşq ilə həm getdi cəhandən».
Bu zəhri çünki Məcnun eylədi nuş,
Düşüb xak üzrə bihuş oldu xamuş
Ki, guya oldu nagah bərqxurdə,
O bərq ilə yıxıldı, oldu mürdə.
Açıb çeşmin, olub nalan dübarə,
Xitab etdi süpehri-günahkarə:
Ki: «Ey çərxi-sitəmpişə, nədir bu?
Nəçün oldun zəbunkoş, ey cəfacu?
Nəçün bu duzəxi qıldın pədidar,
Bu günə başimə oldun şərərbar?
Bana verdin bu ənduhi-girani,
Düşürdün başimə kuhi-girani.
Bəni bərbad etməksə muradın,
Nə hacətdir bu rütbə etisadın?
Ki, bən bir pəşəyəm, naçizi-bipər,
Nə pişə, bəlkə, andən həm zəbuntər.
Bənəm bir mur xari-paşikəstə,
Zəifü natəvan, bitabü xəstə.
Nədir bu tiri zülmü, tiği-bidad,
Ki, bən nə əjdərəm, nə adü Şəddad».
Bulub payan, tamam oldu xitabı,
Rəvan oldu gözündən əşki-nabı.
Bu hal ilə olub məqsudi-meyli,
Təvafi-türbeyi-canbəxşa-Leyli.
Sərasimə olub qıldı əzimət

Ki, Leyli türbəsin etsin ziyarət.
Qərəz bir haldə oldu rəvanə
Ki, tərifi degil qabili-bəyanə.
Olub Zeydi-vəfacu həm inani,
Səbaü vəhşiyan, həm peyrəvani.
Dilidir dərsuzü ahi atəşəfşan,
Gözü xunbarü əhvali pərişan.
Bir əhval ilə kim, halindən anin,
Digərgun oldu hali-vəhşiyanin.
Qılıb səhraləri sirab yaşi,
Edib vadilər içrə ləl daşi.
Gəhi vadilər içrə oldu muyan
Gəhi fəryan ilə səhradə puyan.
Qiyasü həddən əfğani əfzun,
Hesabü həsrdən fəryadi birun.
Gedirdi təngdil əfsurdəxatir,
Olub divanətər getdikcə axir.
Nümayan oldu Leylinin məzari,
Əlindən getdi Məcnunin qərari.
Dilində təbişi mühlik oldu peyda,
Tənində rəşeyi müdhiş hüveyda.
Həman dəm ahi-atəşnak qıldı.
Tənin naxənlər ilə çak qıldı.
İrişdi türbəyə, gəldi fəğanə,
Fəğanindən məlul oldu zəmanə.
Düşüb topraqdə qaltidə oldu,
Rək suzan kimi piçidə oldu.
O rütbə tökdü xunaludə yaşin
Ki, etdi ləlgun ol türbə daşin.
O miqdar oldu giryan, etdi nalə.
Ki, əşki-didəsindən bitdi lalə.
Bu gunə oldu bir dəm novhəpərdaz,
Əz an pəs eylədi təqrirə ağaz –
Ki, səd fəryad kim, dövrü zəmanə,
Dili-sədparəmi döndərdi qanə.
Fəğan kim, olmadım nail muradə,
Fəzayi-dərddə oldum fitadə.
Fəğan kim, olmadı bir çarəsazim,
Təzaid eylədi suzü güdazim.
Pozuldu rövnəqi-bağü baharın,
Əlimdən getdi damani-nigarın.

O dəm kim, gəldi asarim vücudə,
Güzər qıldım bu gülzari-şühudə.
Gülüstani-səbahət içrə yekta,
Lətafət şaxinə pirayəbəxşa,
Həmin bir tazə açmış qönçə buldum,
Həman ol qönçəyə aşüftə oldum.
Anın buyilə hər dəm can bulurdum,
Bulub can xürrəmü xəndan olurdum,
Bizar idim həman ol qönçə tək bən,
Edərdim gülşəni-eşqində şivən.
Sitəm qıldı bənə dövrü zəmanə,
Düçar oldu gülüstanım xəzanə.
Bulub afət o bimanənd qönçə,
Füsurdə oldu ol ovxənd qönçə.
Bənim ol qönçəmi aldı sitəmlə,
Kəbab etdi dilim nari ələmlə.
Həzar əfsus kim, axır cəhandə,
Bu matəmgahdə, bu xakdandə,
Təəşşüqdən bənə bir ad qaldı,
Ümidim pəncəsində bad qaldı.
Verib təğyir təqrirü bəyanə,
Gətirdi tazə bir mətləb miyanə.
Tutub yüz türbəyə oldu xəmidə,
Fəğani oldu əflakə rəsidə.
Xitab etdi ərusi-namuradə,
Dəruni-dərdini etdi ifadə –
Ki: «Ey yekta gülü baği-cəhanin!
Rəhimi-afəti oldu xəzanin
Gülüstani edib bərbad getdin,
Bezar zarini naşad etdin.
Cəhani tərk edib getdin, nigara!
Künun halın nədir xak içrə, yara?!
Necədir dəsteyi-mişki-siyahin?
Necədir dideyi-dilkəş nigahin?
O çeşmi-məst məstxabdırmı?
O keysuyi-tabəndər tabdırmı?
Necədir çöhreyi-xurşidi-tabın?
Necədir püsteyi-migunü nabın?
O çöhrə öylə pərtövdardırmı?
Oləblər öylə şəkkərbardırmı?
Məqamın cənnəti-əlməvamıdır, ya,

Məkanındır riyazi-xüldi-əla?
Olub həşt behişt içrə xuraman,
Edib rüxsari-tabani nümayan.
Qılıb tabəndə eyvani-behişti,
Xəcil qıldınmı hürani-behişti?
Nəçün tərk eylər oldun aşiyanin?
Bu xaki-tirədə qıldın məkanin?
Səninlə xak çün olmuş şərəfnak,
Künun əflakə qoy naz nyləsin xak.
Dəruni-xakdənmiş rahi-cənnət,
Ki, bundan cənnətə qıldın əzimət.
Bəni bu ərsədə sən sibqət etdin.
Gətirdin rəxşini cövlanə getdin.
Edib sibqət, sən etdin əzmi-üqba,
Bəni qoydun fəzayi-qəmdə tənha.
Qəmi-hicrandan zarəm, nigara!
Bu zindən içrə naçarəm, nigara!
Fəraqindən bəni, ey sərviqamət,
Görərsən böylə giryan ta qiyamət!
Künun məcruhü bitabü səqiməm,
Hərimi-türbətin içrə müqiməm.
Edib bu türbədən bir feyz hasil –
Olunca can verib, dilarə vasil.
Bu xaki-pakdən olmam cüda bən,
Edim canım gərək bunda fəda bən».
Dəmadəm ah edib biçarə Məcnun,
Töküb qan növhəgər oldu bu məzmun.
Dilində kargər suzi-nəhandən,
Fərağət etmədi bir dəm fəğandən.
O rütbə ahi-atəşbar qıldı –
Ki, dəhri dudi-ahi tar qıldı.
Gözündən tökdü bir qayətdə xunab,
Ki, ol buqə sərapa oldu sirab.
O rütbə naliş ilə oldu giryan,
O rütbə suziş ilə etdi əfğan
Ki, əfğani-cigərsuzin sərapa
Eşitdi aləmi-oxradə Leyla.
İrişdi nagəhan bir sövti-məknun –
Ki, etmə nalə, ey sərgəştə Məcnun!
Bənəm bir aləmi-nüzhətdə xoşdil
Ki, bu aləmdədir mənzilbəmənzil,

Gülüstani-basəfa məclis mühəyya,
Sürahi xəndə zən, gərdişdə mina.
Nə bunda vardır firqət məlali,
Nə bunda vardır həsrət kəlali;
Vüsalıdır müqərrər bu diyarin,
Səfasıdır mükərrər bu diyarin
Ki, bunda cilvəgərdir lütfi-rəhman,
Olur hər dəm füzun əhsənbəəhsən
Künun var isə səndə vəsl meyli,
Bu bəzmi-xasü bu vüslət, bu Leyli.
Təvəqqüf etmə, bismillah, xuram et!
Bənimlə bunda nuşi-cam kam et!
Bu avazi ki, Məcnun eylədi guş,
Məzarın şüşəsin qıldı dərağuş.
Deyib: Leyli! Xamuş etdi fəğanin,
Rəvan cananinə tapşırdı canin.
Güzərgəhi fənadən oldu birun,
Bu bəndərgahdən həm keçdi Məcnun.
Bu ibrətgahdən Məcnun ki, həm
Güzər qılsa gərəkdir cümlə aləm.
Səadətmənd odur kim, bu fənadə,
Degil dami-fəribə üftadə.
Olubdur mürdə, mərg irməzdən əqdəm,
Edibdir könlünü varəstəü qəm.
Əla, ey qafil, divanəkirdar!
Xəbərdar ol! Xəbərdar ol! Xəbərdar!
Ki, dünya bivəfadır, bibəqadır,
Sərapa cümlə asari həbadır.
Səvar olma əbəs rəxşi-qürurə,
Çıxarma nəfsin əqvasin zühurə.
Fitadəsirət ol, dərvişvar ol,
Bədü niki-cəhanlə xoşmədar ol.
Yetər, bəsdir həvayi-xudpərəsti,
Fəramuş eylə əhdi-ələsti.
Təəşşüq nəşəsin əndişə eylə,
Dili-paki-məhəbbət pişə eylə.
Olub eşq içrə həmpeyvənd Məcnun,
Səvayi tərk qıl manəndi Məcnun.
Hərimi xasdə Məcnun misali,
Həmişə nuş qıl cami-vüsali.
Çü Məcnun irtihal qıldı cəhandən,

Götürdü xeyməsin bu xakidandən.
İrişdi dari-üqbayə səlamət,
Zəbanbənd oldu əfvahi-məlamət.
Zəbaü vəhşlər bir neçə müddət
Edib ol türbeyi-paki hərasət.
Vəfatın bilməyib ol padşahin,
Edirlərdi hərasət bargahin.
Hərasindən səbain kimsə bir an,
O suyə getməyə bulmazdı imkan.
Bu hal üzrə keçib bir neçə əyyam,
Pərakəndə olub getdi dədü-dam.
Telesm oldu şikəstə, rəh güşadə,
Dəxi qalmadı bir maneə aradə.
Gəlib hər kəs edər oldu ziyarət,
Bu keyfiyyət cəhandə buldu şöhrət.
Qəbilə əhli gəldi zarü dilxun,
Yekayek etdilər röyət ki, Məcnun
Edibdir türbeyi-Leylini dər bər,
Qılıbdır canını qurbani-dilbər.
Bu halətdən olub zarü pərişan,
Töküb qan, etdilər fəryadü əfğan.
Edib bir ləhzə min əfsus zahir,
Çəkib ah, oldular məyus axir.
Həman bimari-zarü bitəbibin,
Şəhidi-eşqi-Məcnuni-qəribin.
Təni-pakin edib əşk ilə məqsul,
Mücəhhəz qıldılar mərcubü məqbul.
Güşadə qıldılar Leyli məzarin,
Gülagin etdilər Məcun kənarin.
Çü oldu badəkeş məsti-fətadə
Cəmalin eylədi saqi güşadə.
Həman üftadəsin qıldı dərağuş,
Müəbbəd oldular sərməstü xamuş.
Olub naz ilə rahət tağiyamət,
Rəhayab oldular qəmdən səlamət.
Olub dünyadə bir əhd üzrə payab,
Bəqadə oldular yek məhdü həmxab.
O məzcə üzrə məqbulü münəqqəş,
Mürəttəb qıldılar bir tağı-dilkəş.
Məhəli-feyzi oldu asimanın,
Məlazü məlcayi əhli-cəhanın.

Nə rövzə qibtəgahi-beyti-məmur,
Məqami-ruhbəxşi mənbəi-nur.
Nə dəm kim, gəlsə bir rəncuri-bitab,
Olur filhal rəncindən rəhayab.
Təhi bir kimsə getməz ol məkandən,
Gedər ancaq bulub məqsudin andən.
Olub Zeyd andə peyvəstə mücavir,
Vəfasın eylədi aləmdə zahir.
Şəbanruz olmadı ol büqədən dur,
Həman künci-nihanə oldu gəncur.
Neçə əşar kim, Məcnuni-naşad,
Təriqi-eşqdə etmişdi inşad,
Neçə nəzmi-bəliğü purməani
Ki, mənzum eyləmişdi Leyli ani,
Bədansan ol iki fərxundəfalin,
Sərapa macərasin, şərhi-halin,
Qılıb izhar nəşr etdi cəhanə,
Cəhandə qaldı andan bu fəsanə.
O iki həmdəmi-yari-müvafiq,
O iki aşiq yekruyü sadiq,
Cəhanın keçdilər arayişindən,
Mübərra oldular alayişindən.
İlahi, künci-qofranin güşad et,
Bu iki aşiqi-məsumi şad et!
Ki, bunlar eşqdə ad eyləmişlər,
Diyari-eşqi abad eyləmişlər.
Təəşşüq rəhnümayi-məqbulandır.
Ziyayi-dideyi-rövşən dilandır.
Təəşşüqdür edən insani kamil,
Hərimi-vəsləti canane qabil.
Təəşşüqdən olur hər müşkül asan,
Təəşşüq eyləyir nari gülüstan.
Təəşşüq hadiyi-rahi-hüdadır,
Təəşşüq məbtəli-sehri-həvadır.
Yetər, ey dil, hədisi-sirri mübhəm,
Dəxi urma hədisi-eşqdən dəm!
Ki, əqli-pak kim, ruhül-əmindir,
Həman bağı-firdovsi-bərindir.
Olunca atəşi-sövda firuzan,
Açırsa pər, olur filhal suzan.
Çü şəb kütah, məclis bibəqadır,

Hədisi-eşq isə namünəhadır.
Güzər qıl aləmi-təcridə, Nakam!
Həmayi-ruhi qıl varisteyi-dam.
Fəzayi-eşqi seyr et, ni səvar ol,
Vəli Məcnunsifət, divanəvar ol!

## XATİMEYİ-KİTAB VƏ ŞƏRHİ-HALİ-NAZİMİ MÖHNƏT İNTİSAB

Bəhəmdüllah, təmam oldu bu namə!
Pəzirayi-xitam oldu bu namə.
Nəhayətyab olub həngameyi-eşq,
İrişdi qayətə bu nameyi-eşq.
Gəzib əqsayi-zülmati-nükati,
Bulub nuş eylədim abi-həyati.
Bəsani-Xızr ömri-tazə buldum,
Cəhandə zindeyi-payəndə oldum.
Məhəbbət mülkünü abad qıldım,
Bu darül-xüldi həm bünyad qıldım.
Ki, hər bir beytin məmur edib dil,
Dəruni-ləfzin etmiş ruhə mənzil.
Əgər ki, çeşmdən cismim nahandır,
Vəli hər beytdə sirrim əyandır.
Güzər qıldıqda bu kan birinə,
Mürur etmiş olursa bin qərinə
Hanı Nakam?- edib səslənsə bir kəs,
Deyib ləbbeyk edər hər ləfz bir səs.
Həməldə Afitab olduqda cagir,
Sərir xaməm etdi bədü təqrir.
Dilim piçideyi-əndişə oldu,
Xəyalimlə dilim həmişə oldu.
Gəzib gahi gülüstani-süxəndə,
Gahi səhıi-xiyabani-süxəndə.
Alıb hər şaxədən novxəndə bir gül,
Bulub hər guşədən bir tazə sünbül,
Şükufstani-mənadan bədansan,
Həzara şükufeyi-xoşbuyü əlvan,
Götürdüm, eylədim yekca mühəyya,
Riyahin ilə ətrafi mübərra.
Təəşşüq nəşəsilə dəstə qıldım,
Məhəbbət riştəsilə bəstə qıldım.

Həmana afitabi-aləməfruz
Edincə nöqteyi-mizani-firuz
Bəhəmdullah, fərağət etdi hasil,
Qələm təhrirdən, əndişədən dil.
Riyazi-nəzmdən çıxdım xuraman,
Əlimdə dəsteyi-əzhari-əlvan.
Gətirdim töhfə qıldım dustanə –
Ki, buyi-nəğzi versin nəşə canə.
Degil qabil əgərçi ərməğanim,
Pəsənd eylər vəleykin dustanim –
Ki, ərbabi-hünərdən çeşmdarəm,
Kəramət əhlinə ümidvarəm –
Edərlər macərayi-üzrimi guş,
Olarlar eyləyib insaf xamuş.
Ki, vəqtimdə mənim əhli-zəmanə,
Edərdi kinə mərdi-nüktədanə.
Kimə etsəydim izhari-fəsahət,
Olurdu afərini tənü töhmət.
Kimə kim, olmuş olsaydım qəzəlxan,
Olurdu eyləyib nifrət gürizan.
Kimə inşad qılsaydım qəsidə,
Olurdu fərti-vəhşətdən rəmidə.
Kimə etsəydim ibraz rübai,
Olurdu cəhldən əfzun sədai.
Qərəz, min dəftərin nəzmi-əzizin
Alıb, verməzdi bir kəs bir pəşizin.
Nə rahi-nəzmdə qalmışdı rəğbət,
Nə əhli-nəzmdə asari-miknət.
Lisani-əcnəbi olmuşdu məşhur,
Vəli farsü ərəb qalmışdı məstur.
Zəbani-türki əzəb əlbəyani,
Unutdurmuşdu xaricilər zəbani.
Olub ənqa kimi gum cism daniş,
Cəhandə qalmış idi ismi-daniş.
Degil bəhsim əqalim digərdə
Ki, bən şərh etdiym bu müxtəsərdə.
Cəhalət mülkünə olmuşdu vali,
Pəs Qafqasdə kin əhali
Degil puşidə üzrü digərim həm,
Bilir keyfiyyəti həm cümlə aləm.
Ki, sabiqdə güruhi-şairani

Edib asudə əşrafi-zəmani.
Olublar qədrdani ol güruhin,
Ediblər dəmbədəm əfzun şükuhin.
Alıb hər şairi bir sahibi-şan,
Cinahi-təhtinə etmişlər əhsan.
Olublar nəzmgulər laubali,
Digərgun fikrdən xali xəyali.
Qılıblar dəmbədəm əşar inşa,
Bəliğü behcətavər, ruhbəxşa.
Ediblər yadigari düaləm
Biruni-tedaddən asari-əfxəm.
Bu fövcün əksərinin fərri-cahi –
Olubdur məzhəri-iltafi-şahi.
Diriğa, mən gələn dəmdə cəhanə,
Ədəbdən qalmamışdı bir nişanə.
Hərifan eyləmişdi bəzmi xali,
Bu bəzmin bisükun olmuşdu hali.
Səlasini keçincə sinnü salim,
Keçirdi sərvətü müknətdə halim.
Qərin olduqda ömrüm ərbəinə,
Digərgun oldu əhvali-qərinə.
Olub qaib əlamətü dəyanət,
Pədidar oldu asari-xəyanət.
Olub zahir fəsadi-qəlbi-surin,
Cəhani eylədi matəm sürurı.
Olub nabud asari-mürüvvət,
Qalıb mənsux əhkami-ədalət.
Təəddi ləhzə-ləhzə oldu əfzun,
Cəhanı eylədi rənc ilə məşhun.
Qapandı subəsu babi-sədaqət,
Kərəm məkr oldu, rövnəq buldu xissət.
Bəni həm mübtəla qıldı zəmanə,
Düçar etdi bəlayi-nagahanə.
Pədərdən, cəddən murus malim,
Nə kim var idisə mülki-həlalim,
Səbəbsiz, cürmsüz qəsb etdi miri,
Bəni qıldı qəmi-zillət əsiri.
İlahi, olmasın bir kəs mükəddər!
Olub əvvəl təvangər, müzəttər.
Xudavənda, bicahi-sahübül-tac!
Cəmiyyən müslimini etmə möhtac.

Zəmanın etisadından dəmadəm,
Əsas iqtidarım oldu bərhəm.
Sipahi-zülm ilə tarac oldum,
Düşüb samandən möhtac oldum.
Cəhandən getdi əqranim sərasər,
Mücərrəd qaldım, oldum zarü müztərr.
Füzun oldu müsibət bər müsibət,
Çəkildi sinəmə bin daği-həsrət.
Bulub bərəkssurət hər məramim,
Cəhandə oldu həm Nakam namim.
Əgərçi etməgə inşadi-əşar,
Xəyalət eyləsəydim çarü-naçar,
Gəlirdi xatirə bir-bir diyunim,
Dolurdu xun bağrım ilə üyunim.
Vəli bu kəşməkəşlə bədi-sərkəş,
Edib əndişəmi hər dəm müşəvvəş.
Genə faş etdi əsrari-nəhanim,
Fərağət etmədi açdı dəhanim.
Olub sövdayi-təbin biqərari,
Süxənpərdaz olurdum iztirari.
Bu sövdadən olub məğlub axir,
Sükutə olmadım bilmərrə qadir.
Edib Fərhadü Məcnuni bəhanə,
Təəşşüq sirrini çəkdim bəyanə.
Künun kim, halimi etdim ifadə,
Üzari üzrimi qıldım güşadə.
Görüb bu şərhimi əxyarü əbrar,
Olub bir şəmmə halimdən xəbərdar.
Bilərlər kim, nə gunə dağidarəm.
Nə rütbə binəvayəm, dilfikarəm.
Qüsurimdən keçib, rəhmət edərlər;
Xətam islahinə himmət edərlər.
Ricadərəm ki, fövc xurdə pünhan,
Zərif nüktədanan, pakdinanan,
Olursa bunda gər bir səhvü nöqsan
Anı islah edib eylərlər ehsan
Ki, insan qabili-səhvü xətadır,
Xətakar olmayan ancaq xudadır.
Olub təhrirdən asudə xaməm,
Bulub əncam, xətm olduqda naməm,
Güzər qılmışdı hicrətdən həman dəm,

Hürufi «Ğeyn»ü «şin»ü «dal»ü «ya» həm.
Həm etdim beytini tedad filhal,
O cür geyn oldu, bir ya, bir də bir zal.
Olub baziçəyə məşğul, Nakam!
Əbəs sübh həyatin eyləmə şam –
Ki, kütəhdir zəmani-zindəgani,
Saqın, fövt etmə bu kütəh zəmani.
Tilsimi-nəfsi-qəddari şikəst et.
Dilin pak eylə, ruhi həqpərəst et.
Təriqi-eşqi tut, tərk et cəhani,
Desinlər qoy sana Məcnuni-sani!
Məhəbbət aləmində Kuhikən ol!
Xəlili-Azərasa bütşikən ol!
Cəhati-sətdədən keç, tərki-sər qıl,
Bir xaristani-səflidən güzər qıl.
Rəvan ol gülüstani-binişanə,
Xuram eylə, məkani-laməkanə.
İlahi, müznibəm, çoxdur günahim,
Dərindən qeyri yoxdur bir pənahim.
Siyəhkar olduğumdan şərmsarəm,
Vəli qüfranına ümmidvarəm.
Xütuti cürmümə xətt çək, İlahi!
Ki, sənsən cümlə mücrümlərin pənahi.
Bəhəqqi-xatəmi-xətmi-nübüvvət,
Kitabi-xatiməm qıl basəadət.

1315 hicri